*Bu kitab "**Seyid Əzim Şirvani.** Əsərləri. Üç cilddə. I cild"* (*Bakı, Elm, 1967*) *nəşri əsasında tərtib olunmuş və təkrar nəşrə hazırlanmışdır.*

Tərtib edəni: **Süleyman Rüstəmov**

Redaktorlar: **Qara Namazov**
**Sənan İbrahimov**

Ön sözün müəllifi: **Xeyrulla Məmmədov**

**894.3611 - dc 21**
**AZE**
**Şirvani Seyid Əzim. Seçilmiş əsərləri.** Üç cilddə. I cild. Bakı, "AVRASİYA PRESS", 2005, 400 səh.

Klassik Azərbaycan ədəbiyyatının böyük nümayəndəsi Seyid Əzim Şirvaninin üçcildliyinin birinci cildində şairin qəzəlləri, rübailəri, qoşabeytləri, təkbeytləri, qitələri, tərkibbəndləri, müxəmməsləri, müsəddəsləri və müstəzadları verilmişdir. Verilmiş əsərlər Seyid Əzimin bütün şeirlərini əhatə etmir. Onlar arasından bu günümüz üçün dil baxımından sadə olanlar, məna baxımından aktual və böyük tərbiyəvi əhəmiyyət kəsb edən şeirlər seçilib kitaba daxil edilmişdir. Şairin şeirləri klassik üslubda yazıldığına görə bir sıra sözlərə və beytlərə aydınlıq gətirmək çox vacib idi. Buna görə də kitabın axırında izahlar verilmişdir. Cilddə Seyid Əzimin klassik irsimizə verdiyi ən sanballı şeir nümunələri divan ədəbiyyatının tələbləri əsasında sıralanmışdır.

**ISBN 9952-421-00-X**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# KÖHNƏ DÜNYANIN SONUNCU, YENİ DÜNYANIN BİRİNCİ ŞAİRİ

*Gətirmək tazə üslubə gərəkdir köhnə dünyanı...*
***S.Ə.Şirvani***

Seyid Əzim Şirvani Azərbaycan ədəbiyyatının məşhur xadimlərindəndir. O, klassik Şərq şerinin mütərəqqi ənənələrinin yeni dövrdə qüdrətli varisi, böyük Mirzə Fətəli Axundovun maarifçilik və islahatçılıq ideyalarının alovlu davamçısı və müdafiəçisi, Həsən bəy Zərdabinin ideya silahdaşı, məslək və mübarizə yoldaşı, "cəngi və qəhhar" (N.Nərimanov) poeziyasının yaradıcısı, böyük xalq şairi M.Ə.Sabirin ustadı, məşhur maarif xadimi, realist yazıçı, filoloq alim S.M.Qənizadənin müəllimi olmuşdur. Şair ədəbi yaradıcılığa başladığı gündən həmişə xalq cəbhəsində, cəmiyyətin mütərəqqi meyllərini təmsil edən işıqlı şəxsiyyətlərin cinahında dayanmışdır. XIX yüzilliyin 70-ci illərində ölkədə ideya mübarizələri başlanarkən onun "Əkinçi" ətrafında toplaşan qabaqcıl ziyalılarla eyni mövqedən, çiyin-çiyinə cəhalət və nadanlıq səltənətinə qarşı apardığı mübarizə xalqımızın sosial-mədəni dirçəliş uğrunda gedən döyüşlərinin tarixində dəyərli bir səhifə təşkil edir. Məhz bu məfkurə çarpışmalarında, o, mütərəqqi adamlara rəhbərlik edən maarif və ədəbiyyat mürşidi Həsən bəy Zərdabinin təsiri altında realist ədəbiyyat meydanına gəlmiş, istedadının müxtəlif tərəflərini üzə çıxararaq xalqın xidmətinə vermiş, lirik, satirik və didaktik şeirlərin, mənzum və mənsur hekayələrin, publisist məqalələrin, poetik tərcümələrin, tarixə, ədəbiyyatşünaslığa dair elmi əsərlərin müəllifi kimi məşhurlaşmışdır. XIX əsrin ikinci yarısından sonra Azərbaycanda qüvvətlənən maarifçilik hərəkatının görkəmli nümayəndələrindən biri kimi tanınan Seyid Əzim M.F.Axundovun başladığı ədəbi inqilabı poeziya sahəsində davam və inkişaf etdirmiş, maarifçi realist şeirin dəyərli nümunələrini yaratmaqla doğma ədəbiyyatımıza misilsiz xidmət göstərmişdir. Onun gözəlliyi və təmiz məhəbbəti tərənnüm edən parlaq lirikası, hakim və istismarçı təbəqələrə, mədəni geriliyin müxtəlif təzahürlərinə qarşı çevrilmiş kəskin satiraları, vətənpərvərlik, xalqlar arasında dostluq, insana məhəbbət, xeyirxahlıq, vəfa, sədaqət kimi bəşəri hissləri təbliğ edən öyüd və nəsihətləri, hikmətamiz hekayələri və təmsilləri Azərbaycan bədii təfəkkürünün inkişafı tarixində orijinal bir mərhələ təşkil edir.

* * *

Seyid Əzim Seyid Məhəmməd oğlu Mir Cəfərzadə 1835-ci il iyul ayının 10-da Azərbaycanın qədim şeir-sənət ocağı Şamaxı şəhərində, dindar mühitdə, bir din xadiminin ailəsində anadan olmuşdur. Şairin uşaqlıq illəri bir o

qədər də fərəhli keçməmişdir. O, yeddi yaşında ikən atası vəfat etmiş, anası Gülsüm xanımla dəbdəbə və təntənəsi pozulmuş ata-baba ocağında sıxıntılı bir həyat keçirməli olmuşdur. Bu vəziyyətdən narahat olan şairin Dağıstanda yaşayan ana babası Molla Hüseyn onları hakimi olduğu Yaqsay kəndinə aparıb himayə etmişdir. Oğul övladı olmayan Molla Hüseyn bütün məhəbbətini balaca nəvəsinə salmış və onun təlim-tərbiyəsi ilə ciddi surətdə məşğul olmuşdur. Yaqsay kəndi şairdə xoş xatirələr saxlamışdır. XIX əsrin səksəninci illərində babasının yurdunu ziyarət edən S.Ə.Şirvani onu növrağı pozulmuş, pərişan halda, başqa sözlə, yadların əlində görüb dərindən kədərlənmişdi. Şeirlərinin birində səfər təəssüratını ifadə edərək yazırdı:

...Sərvəra, üç aydı getmişdim Dağıstan seyrinə,
Bu səfərdən olmuşam xeyli pərişan, gəlmişəm.
Görmüşəm biganə dəstində babamın mülkünü,
Qeyrətimdən qönçə tək bağrım olub qan, gəlmişəm[1]...

Seyid Əzim Şirvani Dağıstanda yaşadığı on bir il ərzində ərəb-fars dillərini və yerli ləhcələrin bir neçəsini öyrənmişdir. Bu isə şairə yaşadığı mühitdə dəbdə olan bir sıra elmləri dərindən öyrənməyə və erkən yaşlarından kamil və zəkalı bir gənc kimi yetişib şöhrət qazanmağa imkan vermişdir. O, "Rəbiülətfal" məcmuəsinə "Nazimin ifadəsi" başlığı altında yazdığı mənzum müqəddimədə uşaq yaşlarından elmi bilikləri həvəslə öyrənməsindən söhbət açaraq deyirdi:

...Oldum ol gün ki, çardəh salə,
Düşmədim fikri-dövlətü malə.
Eylədim arifanə kəsbi-ülum,
Gah Bəğdad məskənim, gah Rum.
Eylədim Misrü Şamdə məva,
Gah yerim Yəsrib oldu, gah Bətha.
Oxudum nəhvü sərfü fiqhü üsul,
Hikmətü heyət eylədim məhsul... (II, 371)

Seyid Əzim 1853-cü ildə Dağıstandan doğma vətəni Şamaxıya qayıdır. Artıq o, 18 yaşlı yetkin və kamil bir gənc idi. Onun özünəməxsus şəxsi və ictimai qayğıları yaranmışdı. Bunların başlıcası ailə həyatı qurmaqdan və çırağı sönən ata-baba yurdunun keçmiş dəbdəbəsini geri qaytarmaqdan ibarət idi. Seyid Əzim 19 yaşında Ceyran xanım adlı şamaxılı bir qızla ailə həyatı qurur. Bununla əsas qayğılardan biri rəf olur. O, təhsil almaqdan ötrü yollar axtarır.

---

[1] S.Ə.Şirvani. Əsərləri. Üç cilddə, II cild, Bakı, Azərbaycan EA Nəşriyyatı, 1969, səh. 297. Müqəddimədəki misallar bu nəşrdən götürülmüşdür. Bundan sonra cild və səhifə göstəriləcəkdir (*X.M.*).

Nəhayət, çıxış yolunu ərəb Şərqinin dini və inzibati mərkəzlərinə getməkdə görür. Şair 1855-ci ildə İraqa yola düşür. Bir neçə il Nəcəf – Əşrəfdə "təkmili-elm" edir. Bir müddət Bağdadda, bir qədər də Şamda nümunəvi mədrəsələrdə müxtəlif dini elmləri, Şərq fəlsəfəsini, ərəb ədəbiyyatını, İslam tarixini, ərəb dilinin sərf-nəhvini öyrənir. Şairin təhsil illəri ağır ehtiyac içində keçir. Şamda oxuyarkən vəziyyəti daha dözülməz şəkil alır. Şeirlərinin birində sıxıntılarından, vəziyyətindən şikayətlənərək yazırdı:

Diyari-Şamə ol gün kim, məni hökmi-qəza çəkdi,
Nə möhnətlər gör ol viranədən bu binəva çəkdi...

* * *

O, təhsilini başa vurub, dini və dünyəvi məsələlərə yiyələnən ziyalı kimi vətənə qayıdır. Bununla belə şair daim həyatı dərindən öyrənmək, bilik dairəsini daha da genişləndirmək, müşahidələrini dərinləşdirmək arzusu ilə çırpınır. Səyahət etmək arzusu ilə yaşayan şair Şamaxı varlılarından Əlabbas adlı birisinin xahişini qəbul edib, onu Məkkə ziyarətinə aparır.

Ziyarət başa çatdıqdan sonra Qahirə və Ərəbistanın şəhərlərini gəzib dolaşır, Türkiyə və İranda olur. Səfər zamanı çoxlu alim, arif və gözüaçıq adamlarla görüşüb həmsöhbət olur. Vətənə Hacı kimi dönərək el arasında Hacı Seyid Əzim kimi məşhurlaşır.

Bütün bunlar məşhur Süveyş kanalının inşa edildiyi, Şərqdə Avropa müstəmləkəçilərinə qarşı mübarizənin şiddətləndiyi, panislamizm və digər yeni ideoloji cərəyanların yarandığı, sosial həyatda, habelə məişətdə ciddi islahatların həyata keçirildiyi mürəkkəb bir dövrə təsadüf edir. Ərəb Şərqində və eləcə də bütün müsəlman aləmində baş verən bu dəyişikliklər Seyid Əzimə qüvvətli təsir göstərir.

Təhsilini və səyahətini başa çatdırıb, vətəndə həmişəlik məskunlaşan Seyid Əzim burada da əvvəl gördüklərinə oxşamayan bir vəziyyətlə qarşılaşır. Artıq xalqda ictimai məsələlərə maraq qüvvətlənmişdi. Avropa tipli məktəblərdə oxuyanların sayı artırdı. M.F.Axundovun "Təmsilat"ı yayılıb, vətəndaşların şüuruna və zövqünə güclü təsir göstərmişdi. Real həyatdan, faydalı məzmundan, rəğbətli formadan məhrum şeirlərə maraq azalmışdır. Hər tərəfdən ictimai mübarizələrin əks-sədasını poeziyaya gətirmək istəyənlərin gur səsi eşidilirdi.

Bütün bunların təsiri altında S.Ə.Şirvani həyat yolunu dəyişdi, özünün dediyi kimi, "məscid yolun tərk" edib, məktəbə üz tutdu. Geniş mənada bu o demək idi ki, şair başına əmmamə qoyub, əba-qəbaya bürünüb qaragüruh və riyakar ruhani dəstəsinə qoşulmadı, öyrəndiyi elmləri xalqı soyub talamaq üçün "quldurçuluq tüfəngi"nə çevirmədi. Əksinə, şəxsi mənafeyini və rifahını xalqa xidmətdən üstün tutan ruhaniləri iti qələminin nişanəsinə qoydu. Onların əba və əmmamə altında gizlənmiş hiylə və xəyanətlərini yüksək vətəndaşlıq cəsarətilə aləmə faş etməyə başladı. Beləliklə, Seyid Əzimlə onun

üzvü olmağa hazırlaşdığı dindarlar mühiti arasında məfkurə döyüşləri şiddətləndi. Məşhur jurnalist və yazıçı Cəlal Ünsizadənin[1] dediyi kimi "həcviyyələrində bir çox bəy, vaiz və filanların qəlbkar və tiflbəkkarlıqlarını lisan-əvam ilə əvamünnas qulağına doldurdu". Bununla da hər yerdən təcrid olundu.

* * *

İnsanlar arasında tək yaşamaq şairi dərin maddi və mənəvi böhrana düçar etdi. "Daireyi ruhaniyundan fərar və miyani-cismaniyyunda qərar tutmağa" məcbur olan şair "əyyaşlarilə həmməclis oldu. "Ehtiyac... şirdil olan Seyidi rubəhməzac" etdi.

Lakin xoşbəxtlikdən bu vəziyyət uzun müddət davam etmədi. Şirvan mülkündə şairin nadir istedadını, Şərq elmlərinə dair zəngin biliyini qiymətləndirən ariflər tapıldı.

1874-cü ildə Şamaxıda qabaqcıl ziyalı və mütərəqqi din xadimi Hacı Səid Ünsizadənin[2] təşəbbüsü və səyi ilə "Məclis" adlı müasir tipli məktəb yaradılarkən Cəlal Ünsizadə ilə bərabər S.Ə.Şirvani də orada müəllim işləməyə dəvət olundu. Bir sıra köhnə və yeni tədqiqatlarda S.Ə.Şirvaninin 1867-ci ildə Şamaxıda məktəb açdığı iddia olunur. Bu mülahizə yanlışdır. Şair 1879-cu ildə Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində Azərbaycan dili və şəriət fənləri üzrə müəllim yerini tutmaq üçün yazdığı ərizədə 1874-ci ildən pedaqoji fəaliyyətə başladığını qeyd etmişdir. İlyarım işlədikdən sonra Hacı Səid və Cəlal Ünsizadə qardaşları Tiflisə köçür, məktəb və onun 70 nəfər şagirdi S.Ə.Şirvaninin öhdəsinə qalır. Ağır bir şəraitdə, "tamamilə yoxsul olmasına baxmayaraq", heç bir rəsmi idarədən və cəmiyyətdən maddi yardım və maaş almayan şair məktəbi, demək olar, pulsuz-parasız, yalnız şagirdlərdən toplanan cüzi təhsil haqqı ilə idarə edir.

---

[1] Cəlal Ünsizadə (1854-1932) XIX əsrin 70-90-cı illərində xalq maarifi və dövri mətbuat sahəsində çalışan qabaqcıl ziyalılardandır. O, "Ziya" ("Ziyayi-Qafqaziyyə", 1879-1884) qəzetinin redaktoru, "Kəşkül" jurnalı və qəzetinin isə naşiri və redaktoru olmuşdur. C.Ünsizadə Şillerin "Məkr və məhəbbət", Puşkinin "Boris Qodunov" pyeslərini, Turgenevin mənsur şeirlərindən bir neçəsini, gürcü şairi Çavçavadzenin şeirlərini, fransız yazıçısı Montepianinin "Qanlı gecə" romanını, ərəbcədən "Əmsali-Loğman" adlı təmsillər məcmuəsini, özbəkcədən "Şeybaninamə"ni Azərbaycan dilinə tərcümə etmişdir.

[2] Hacı Səid Ünsizadə (1839-1905) Şamaxıda mədrəsə bitirmiş, Bakı quberniyası Şamaxı Sünni Ruhani idarəsinin üzvü olmuşdur. O, Ruhani İdarəsinin təlimatına istinad edərək 1874-cü ildə "Məclis" adlı məktəb təsis etmiş, bununla da Azərbaycanda müasir təhsil hərəkatının əsasını qoymuşdur. Maarifçi ruhani 1877-ci ildə Tiflisə Qafqaz Sünni Ruhani idarəsinə ezam edilmiş və burada xüsusi mətbəə yaradaraq "Ziya" ("Ziyayi-Qafqaziyyə") adlı qəzet nəşr etmişdir. Uşaq ədəbiyyatı yaratmaqla da bu illərdə məşğul olmuşdur.

Seyid Əzim Şirvaninin bu fədakarlığı o zaman maarif orqanlarının diqqətindən yayınmır. Rəsmi yazışmaların birində onun haqqında deyilirdi: “Bu məktəb 1875-ci ildə (müəllif yanılır, məktəb 1874-cü ildə təşkil edilmişdir – X.M.) açılmışdır. O, ancaq Seyid Əzim Məhəmməd oğlunun səyi ilə yaşayır... Otuz nəfər dil kağızı verib məktəbi saxlamaq üçün ayda bir manat verəcəklərini öhdələrinə götürdülər, lakin öz vədlərini yerinə yetirmədilər”[1]. Başqa bir dəftərxana yazışmasında maarif müfəttişi Seyid Əzimin pedaqoji fəaliyyətinin səmərəsindən söhbət açaraq yazırdı: “O, (“Məclis” məktəbi – X.M.) ancaq... Hacı Seyid Əzim Seyid Məhəmməd oğlunun səyi ilə yaşayır. Şərq – ərəb-fars və türk dillərini bilməsi, müsəlman fanatizmindən uzaq olması sayəsində o, təqlid olunmağa layiq, xeyirxah bir işdən yapışdı. Məktəb yaratmaq, müsəlman həmşəhərlilərinə Quran və ana dili ilə yanaşı rus dili və hesab fənlərinin öyrədilməsi burada müsəlman məktəblərində nadir hadisədir”[2]. Maarif orqanlarının demokratik görüşlü nümayəndələri Seyid Əzimin pedaqoji təcrübəsini xalq arasında yaymağı və Bakı, Quba, Lənkəran, Salyan və b. şəhərlərdə “Məclis” tipli məktəblər açmağı təklif edirdilər.

“Məclis”də işləməklə yanaşı, S.Ə.Şirvani 1877-ci ilin sentyabrında H.Zərdabinin köməkliyi ilə Şamaxı şəhər məktəbinə müəllim təyin olunur. Rəsmi dövlət qulluğuna düzəlmək şairin maddi və mənəvi vəziyyətinin dirçəlişinə yaxşı təsir göstərdi. Müasir elmi biliklərin tədris edildiyi məktəbdə, ali təhsilli müəllimlərin əhatəsində şair pedaqoji ustalığını daha da təkmilləşdirir. O, rus ədəbiyyatı və pedaqoji fikrinin görkəmli simalarının əsərlərindən səylə bəhrələnir, hətta Puşkinin şeirlərini fars dilinə çevirməyə təşəbbüs göstərir. Məişət qayğılarından az da olsa azad olan şair asudə vaxtlarını tamamilə bədii və elmi yaradıcılığa sərf edir.

Şair-pedaqoq Şamaxıdakı “Beytüs-Səfa” şairlər məclisində fəaliyyət göstərməklə yanaşı, Bakı, Lənkəran, Ərdəbil, Şuşa, Dərbənd, Ordubad və s. qəza mərkəzlərindəki ədəbi məclislərin üzvləri ilə də müntəzəm surətdə yazışır.

Beləliklə, o, ölkədə poetik həyatın canlanmasında mühüm rol oynayır.

Pedaqoji işdə çalışmaq şairi xalq həyatına daha da yaxınlaşdırır və onun konkret ehtiyacları ilə qarşılaşdırır. O, Azərbaycan məktəblərində şəriət və ana dilinin tədrisindən ötrü dərslik yaratmağa təşəbbüs göstərir. “Əhvali-ənbiya”, “Rəbiül-ətfal” və “Tacül-kütub” dərslikləri üzərində işləyir.

1875-ci ildə Bakıda Həsən bəy Zərdabinin redaktorluğu altında “Əkinçi” qəzetinin nəşrə başlaması Seyid Əzimin bir vətəndaş şair kimi hərtərəfli parlamasına, yaradıcılığının dərin ictimai məzmun, satirik kəskinlik kəsb etməsinə, ədəbi mövqeyini qəti surətdə müəyyənləşdirməsinə, baxışlarının aydınlaşıb büllurlaşmasına imkan yaradır. “Əkinçi”nin ilk nömrələri yayılan kimi, o, dərhal səsini H.Zərdabinin səsinə qatdı, yaradıcılığını qəzetin ideya

[1] Gürcüstan Respublikası Dövlət Tarix Arxivi, fond 422, səh. 1, iş 916, vərəq 30

[2] Yenə orada

istiqamətinə uyğunlaşdırdı və maarifçilik ideyalarını şairanə bir coşqunluqla təbliğ və tərənnüm etməklə, "Əkinçi" ansamblına orijinal bir ahəng gətirdi. Seyid Əzim Şirvani H.Zərdabiyə göndərdiyi bir məktubda üzərində işlədiyi "Rəbiül-ətfal" kitabındakı şeirlərlə "Əkinçi"dəki məqalələr arasında mövzu və ideya yaxınlığından söhbət açaraq yazırdı: "...Öz türki lisanımızda çox asan ibarətlərlə bir türki kitab nəzm etmişəm. Haman kitabdan bir neçə əşar ki, bundan sonra yazılacaq, yazıb xidmətüvüzə irsal elədim ki, çap edəsiz ki, Sizin qəzetin məzmununda olan mətləblərə münasibdir" (II, 127).

Əlbəttə, şair vəzifəsini təkcə bununla məhdudlaşdırmadı. O, "Əkinçi"nin nəşri ilə mütərəqqi və mürtəce qüvvələr arasında şiddətlənən ideya döyüşlərinə qoşuldu. Qabaqcıl fikirlərinə görə H.Zərdabini nalayiq sözlərlə təhqir edən Həsən Qara Hadi və kapitan Sultanov kimi geridə qalmış adamlar S.Ə.Şirvani satirasından ölümcül zərbə aldılar. Fikir ixtilafları və ədəbi mübarizələr Seyid Əzim tərəfindən "Əkinçi" ideya döyüşlərinin poetik salnaməsinin yaradılması ilə nəticələndi. Bununla da XIX əsrin 70-ci illərində Seyid Əzim Şirvaninin yaradıcılığı ilə Azərbaycanda tamamilə yeni məzmunlu poeziya, maarifçi-realist şeir məktəbi formalaşdı.

S.Ə.Şirvaninin xalq maarifi və demokratik mətbuat meydanına gəlişi, istedadını qabaqcıl ideyaların xidmətinə verməsi onunla mühiti arasında ziddiyyətləri daha da kəskinləşdirdi. Şair yaşadığı cəmiyyətin müxtəlif təbəqələrinin hücumlarına məruz qaldı. Ruhanilər onu cürbəcür vasitələrlə yaradıcılıq yolundan çəkindirməyə çalışırdılar. Bəylər və ağalar rəiyyəti onların pis əməllərindən xəbərdar etdiyinə görə şairi xoşlamır, maddi yardım göstərməməklə ondan intiqam alırdılar. Avamlar Seyid Əzimi onların dünyagörüşü və bədii zövqü ilə hesablaşmayıb, rəğbət bəsləmədikləri məsələlərə dair əsərlər yazdığına görə məzəmmətləyir, şairə öz estetik və etik normalarını diktə edib, məcazlarına uyğun gələn "əfsanəvi mövzularda, nağıl və rəvayətlər aləmində əsərlər yazmağı təklif edirdilər" (F.Köçərli). Hökumət məmurları isə onu çarizmin mənfur müstəmləkəçilik siyasətini müdafiə etmədiyinə görə adını polis dəftərxanasında saxlanan qaytanlanmış qara kitaba salır və təqib edirdilər. O, şeirlərinin birində mühitin ona münasibətindən şikayətlənərək yazırdı:

...Ta ki müstəcmii-ülum oldum,
Nəzəri-əhli-əsrə şum oldum...
...Eylədim taki hər büsatə güzər,
Məni gördükdə xəlq söylədilər:
Budu, gəldi səfahətin kani,
Hacı Seyyid Əzim Şirvani... (II, 371)

Şairin susmadığını görən düşmənləri mübarizənin o zaman dəbdə olan kütləvi formalarına əl atırdılar. Məmurlar danos verməklə, şairlər həcv yazmaq, ruhanilər lənət yağdırmaq, avamlar təhqir etməklə onu susdurmağa çalışırdılar. 1879-cu ilin yazında Seyid Əzimə edilən hücumlar özünün gərgin nöqtə-

sinə çatdı. “Şəriət” fənninin tədrisindən ötrü yazdığı dərslik Peterburqdan mənfi rəylə qayıtdıqdan sonra Tiflisdə və Şamaxıda məmurların əlinə fürsət keçdi. Uşaqlara yazdırdığı mətnlər toplanıb təhlil edildi. Onun dərsliklərində hökumətin siyasəti ilə səsləşməyən motivlər “tapılıb” üzə çıxarıldı. Nəhayət, şair “siyasi etibarsız”lıqda ittiham edilib, müəllimlikdən çıxarılması haqqında gizli sərəncam verildi. Lakin o, düşmənə təslim olmadı.

Seyid Əzim rəsmi maarif idarələrinin verdiyi “beş-üç kağız” manat müqabilində onun məslək və mənəviyyatını satın almaq fikrinə düşənlərin qondarma ittihamlarını iri rütbəli maarif məmurlarının qarşısında təkzibedilməz dəlillərlə rədd etdi. Tiflisə şikayətə gedən şairin qüvvətli məntiqi qarşısında təslim olan Qafqaz Təhsil Dairəsinin popeçiteli K.P.Yanovski ondan üzr istəyib, iş yerinə bərpa olunması haqqında göstəriş verdi. Beləliklə, S.Ə.Şirvani ömrünün sonuna qədər hər iki məktəbdə müəllimlik fəaliyyətini davam etdi. Mübarizəni qələbə ilə başa çatdıran şair yaradıcılıq planlarını həyata keçirməyə girişdi. O, “Rəbiül-ətfal” məcmuəsini təkmilləşdirib yeni variantını yaratdı. 1883-cü ildə “Tacül-kütub” dərsliyini və Azərbaycan, İran və Türkiyədə yaşamış 270 türkdilli şairin bioqrafiyası haqqında məlumatı və əsərlərindən nümunələri əhatə edən “Təzkirə”sini bitirdi. “Tarixi-Şirvannamə” əsəri üzərində işini davam etdi. “Rəbiül-ətfal” və “Tacül-kütub” dərsliklərini “Müntəxabat” ümumi başlığı altında xalq maarifi orqanlarına verib, onun nəşri uğrunda mübarizəyə başladı. Bütün bunlar Seyid Əzimi fədakar və döyüşkən xalq müəllimi kimi məşhurlaşdırdı.

1886-cı ilin ortalarında Qafqaz Canişininin Mülki işlər üzrə dəftərxanası pedaqoqun xalq maarifi sahəsində xidmətlərini nəzərə alıb, onun sinədə daşımaq üçün Stanislav lenti üzərində “Səyinə görə” sözləri yazılmış gümüş medalla təltif olunması barədə məsələ qaldırdı. Bununla əlaqədar rəsmi idarələr arasında iki il yazışma, məşvərət və məsləhətləşmə davam etdi. Seyid Əzim gümüş medalı yalnız 1888-ci il may ayının 10-da ala bildi. Qəribə burasıdır ki, şair bu fərəhli hadisədən on gün sonra, 1888-ci ilin 20 mayında, ömrünün çiçəklənən çağında qəflətən vəfat etdi və Şamaxının Şahxəndan qəbiristanlığında dəfn olundu.

* * *

Seyid Əzim Şirvani ədəbi yaradıcılığa XIX əsrin 50-ci illərində 18-20 yaşlarında lirik şair kimi başlamışdır. O, klassik şerin qəzəl, qəsidə, rübai, qitə, tərkibbənd, müxəmməs, müsəddəs, müstəzad kimi şəkillərində dəyərli poetik nümunələr yaratmış, müasirləri arasında məliküşşüəra – şairlər başçısı kimi şərəfli bir ləqəbə layiq görülmüşdü.

Seyid Əzim yeni poetik forma icad etməmişdir. Lakin o, ənənəvi klassik Şərq şeir janrları çərçivəsində “polad kimi bitkin və möhkəm, qəlbin dərinliklərindən aşıb gələn şeirlər”[1] yazmış, əski formalarda müasir həyat məsələlərini, insan münasibətlərini real şəkildə ustalıqla əks eləmişdir. Başqa

sözlə, min illər boyu inkişaf edib gələn və pozulmaz qanunları, mizanları, xüsusi mövzuları, təsvir predmeti, obyektləri və subyektləri olan və əksər hallarda romantik tülə bürünən şeir formaları Seyid Əzim qələminin qüdrəti sayəsində real həyat həqiqətlərinin, cəmiyyətin müxtəlif təbəqələri arasında kəskin ziddiyyətlərin, dünyəvi hisslərin, yüksək mənəvi keyfiyyətlərin, ülvi məhəbbətin ifadə vasitəsinə çevrilmişdir. Xüsusilə, XIX əsrin ikinci yarısında tərəqqi hərəkatının qarşısında keçilməz maneəyə çevrilən, cəmiyyətdə mürtəce rol oynayan, "öz şəxsi mənafeləri üçün Quranı və peyğəmbər tərəfindən qoyulmuş şəriət təliminin mənasını istədikləri kimi təhrif edən vaizlərin və axundların təlimini alt-üst etmiş", fiziki və mənəvi zülmün təzyiqi altında əzilib paymal olan məzlum kütləyə həqiqəti anlatmışdır.

Seyid Əzim Şirvaninin bədii zövqü klassik Şərq, o cümlədən Azərbaycan şerinin çoxəsrlik ənənələri zəminində cilalanıb formalaşmışdır. O, Əbu Nüvvas, İmrəlqeys, Firdovsi, Nizami, Xaqani, Xəyyam, Sədi, Hafiz, Rumi, Cami, Füzuli kimi qüdrətli sənətkarların ədəbi irsini dərindən öyrənib mənimsəmiş və onlardan ardıcıl surətdə yaradıcı şəkildə bəhrələnmişdir. Şairin bütün yaradıcılığı boyu klassik şeir formalarına (bəzən sıx, bəzən seyrək müraciət etməsindən asılı olmayaraq) xüsusi maraq göstərməsinin bir səbəbi də sözün müsbət mənasında Şərq ədəbiyyatı klassiklərinə aludəçilik göstərməsi olmuşdur. Lakin buna baxmayaraq Seyid Əzim Şirvani lirikası öz məzmun və mündəricəsi etibarı ilə orijinal ahəngdə səslənir və sələflərinin yaradıcılığından bir sıra əlamətləri ilə seçilirdi. Şərq şeri bütün məziyyətlərinə, xüsusilə insan kultunu təbliğ, yüksək humanist duyğuları tərənnüm etməsinə baxmayaraq, o, yarandığı feodalizm dövrünün ideoloji və bədii məhsulu idi. Bu poeziya orta əsrlərin dini-mistik ideyalarından, müxtəlif adlar altında yaranmış təriqətlərə məxsus rəmz və rümuzlardan azad deyildi. Seyid Əzim isə yeni əsrin, təzə dünyanın, kapitalist inkişafı dövrünün sənətkarı idi. Elə bir zamanın ki, neft sənayesinin yüksəlişi ilə təbii texniki biliklərin inkişafına geniş meydan açılmışdı. İctimai həyatın mənzərəsi mürəkkəbləşib cəmiyyətdə təbəqələşmə, bir-birinə zidd siniflərə parçalanma prosesi başlanmışdı. Bütün bunlar öz növbəsində dünya, insanı əhatə edən coğrafi məkan və sosial mühit haqqında müsəlman zəhmətkeşlərində aydın və obyektiv qənaətin formalaşmasına səbəb olmuşdu. Yaxın və Orta Şərqi gəzib dolaşan, ağıla və ürəyə fayda verən çox şey görüb, çox şey öyrənən, vətəndə isə sənaye və ticarət burjuaziyasının ilk müvəffəqiyyətli addımlarını müşahidə edən şairdə emprik də olsa, həyat və cəmiyyətin inkişaf qanunları haqqında düzgün qənaətlər yaranmışdı. Başqa sözlə, şüuru dini-mövhümü təsəvvürlərin buxovundan xilas olub, real məndəricə qazanmışdı. O, artıq təbiətin fövqündə fövqəlbəşər qüvvələrin mövcud olması haqqında əfsanələri qəbul etmirdi. Onun üçün həqiqət ana təbiətin qoynunda mövcud olan gerçəklikdən ibarət idi.

---

[1] F.Köçərli. Seçilmiş əsərləri. Bakı, 1963, səh. 69

Seyid Əzim Şirvani dünyagörüşünün bu xüsusiyyəti onun yaradıcılığının realist istiqamət almasında həlledici rol oynadı. Şair əski poetik formalarda təzə əsrin qabaqcıl ictimai meyllərini təbliğ etməklə milli şeirdə maarifçi-realist metodu əsaslandırmağa nail oldu. Buradan irəli gələrək real həyat məsələləri və insan münasibətləri lirikasının məğzini təşkil etdi. Onun əsərlərində artıq orta əsr şairlərinin romantik insan səciyyələrindən, ağılın qail olmadığı məsələlərin təsvirindən əlamət qalmadı. O, müxtəlif funksiya icra edən əski poetik formaları cəsarətlə müasir həyat məsələlərinin xidmətinə verdi. Real hadisə və insan münasibətlərinin təsviri Seyid Əzimin yaradıcılıq uğurlarını təmin etdi.

Seyid Əzim bədii yaradıcılıq aləminə, əsasən, qəzəl yazmaqla gəlmişdir. Şərq şerinin bu populyar şəklində əsər yazmağı şair yaradıcılığının bütün mərhələlərində davam etmişdir. Ədəbi ənənəyə, janrın şərab və qadın məhəbbətinin tərənnümü ilə məhdudlaşan ilkin funksiyasına sadiq qalaraq məhəbbətdən doğan iztirabların, ayrılıq dərdi, vüsal həsrətinin, sevən, eşq atəşinə yanan aşiqin təmiz hisslərinin təsviri Seyid Əzim qəzəllərinin mühüm bir qismi üçün səciyyəvi idi. Aşiq-məşuq münasibətləri onların əsas məzmununu təşkil edirdi. "Əsil tiynətim məhəbbət torpağından məxmur... olmuşdur" deyən şair məhəbbəti varlığın təməlində duran və yaranmışları fəaliyyətə sövq edən qüvvə, eşq aləmini vətəndaşların bərabərliyini və ləyaqətini təmin edən məkan hesab edirdi:

...Eşqdir ol qüvveyi-cazib ki, xaki-Məkkədən
Etdi cismi-ünsüriyyi, Əhmədi ərşaşina.

Eşqdir kim ki, edər vadiyyi-eyməndən xüruş,
Eşqdir kim ki, dirəxti-Turdən eylər nida,

Ol Gədayi-eşq, sultanlıq muradındır əgər –
Kim, diyari-eşqdə afaqə sultandır gəda... (I, 40)

Bu məqamda şair zahirən sələflərindən seçilmir, Füzuli ilə eyni mövqedən çıxış edərək onunla birləşirdi. Lakin bu ilk baxışda belə görünür. Klassik şerin insan gözəlliyini tərənnüm edən və onu bütün yaranmışların ülvisi saymaq ənənəsini inkişaf etdirən Seyid Əzim qəzəlin təsvir obyektini xeyli konkretləşdirir və orada müasirlərinin obrazını yaradır, səciyyəvi xüsusiyyətlərini, həyat-məişət qayğılarını, daxili aləmlərini əks edirdi. S.Ə. Şirvani lirik qəzəllərinin qəhrəmanı hər şeydən əvvəl onun müasiridir, onunla bir diyarda, bir şəhərdə yaşayır. O məşuqəsinin adını, hətta ünvanını da nişan verir.

...Saradır adın, ikki saçın ənbəri-sara,
Saçın kimi aləmdə sənin müşki-tər olmaz... (I, 150)

Yaxud:

İstərəm bir gülü nə bagü, nə bostan gülüdür,
Bülbüləm bir gülə kim, rövzeyi-rizvan gülüdür...

...Cümleyi-rövzeyi-rizvanda tanılmaz belə gül,
Güli-xoşrayihədir, çünki bu Qazyan gülüdür.

Bu güli-xilqəti-xaliqdə lətafət çoxdur,
Sanma kim, bu güli-xoşrayihə Salyan gülüdür... (I, 166)

Qürbətdə olan şair Şirvandakı sevgilisinin həsrətini çəkir, vətənə qayıdıb onun üzünü seyr etmək arzusu ilə çırpınır.

Nə tutmuşsan, könül, qürbət diyarın, əzmi-Şirvan et,
Tamaşayi-ruxi-yar ilə seyri-kuyi-canan et. (II)

Şairi qəm-qüssəyə salan, "Yəquba döndərib" sakini "beytül-həzən" edən, iki gözünü Bəhreynə döndərən də şirvanlı gözəlin dərdidir.

...Ol Yusifi-gülçöhrə qəmindən sənə Seyyid,
Şirvan niyə hər ləhzədə beytül-həzən oldu.

Şairin məşuqəsi zahirən gözəl, daxilən kamildir. O, yer üzərində yaradılan və əfsanələrdə gözəl sanılıb vəsf olunan hər şeydən üstündür. Fiziki və mənəvi cəhətdən həmahənglik onu təbiətin nadir icadına çevirmişdir:

Yarım kimi bir sərvü qədgülbədən olmaz,
Rüxsarına bənzər o gülün nəstərən olmaz.

Məcruh olur, ey gül, bədənin sayeyi-güldən
Qurbanın olum mən, belə nazik bədən olmaz... (I, 135)

Dəryada onun dişinə oxşayan mirvari, mədəndə dodağına bənzəyən Yəmən daşı yoxdur.

...Dəryada dişin tək düri-şəhvar tapılmaz,
Ləlin kimi kan içrə əqiqi-Yəmən olmaz. (I, 135)

Şair gözəllik qarşısında vəcdə gəlir. Onu qiymətləndirib sevməyi bacarmayanı insan adını daşımağa layiq bilmir. O, belələrini başı noxtalı heyvana bərabər tutur:

...Heyvandı ki, yox başının əfsarı, həqiqət,
Hər kimsənə kim, aşiqi-vəchi-həsən olmaz... (I, 135)

Gözəlin cövrünə, cəfasına dözməkdən ləzzət alan şair onun yolunda şəhid olmaqda bir fədakarlıq əlaməti görür.

...Dəfn eyləyin üryan məni küyündə o mahın,
Şərilə müşəxxəsdi, şəhidə kəfən olmaz... (I, 135)

Şair qadın gözəlliyini dinin müsəlmanlar üçün müqəddəs elan etdiyi hər şeydən üstün tutur. Onun nəzərində ən yaxşı ibadət gözələ və gözəlliyə səcdə etməkdən ibrətdir. O, gözələ məxsus nişanələri dini atributlara qarşı qoyur:

...Sureyi-Vəlleyl zülfündür, yüzün Vəşşəmsdir,
Qəm degil aləmdə bundan qeyri Quran olmasa. (I, 48)

Seyid Əzim gözəlin üzünü Kəbəyə, xalını qara daş – Həcərə, saçlarını onun örtüyünə, zənəxdanını Zəmzəmə oxşadır. Şair canlı insan, qadın və onun gözəlliyinə biganə olub, dini mərkəzlərdə daşa, torpağa səcdə etmək üçün ziyarətə gedənləri zövqsüzlükdə, həqiqəti anlamamaqda ittiham edir.

Hər il ki, Kəbəyə hüccac tazə-tazə gedərlər,
Bilib ol evdə məgər xaliqi, niyazə gedərlər.

Həcər ol xal, üzün Kəbə, qarə örtügü zülfün,
Qoyub səni, niyə hüccaclar Hicazə gedərlər.

Həqiqi Kəbəsi sənsən Həqin, nə səngü gil, ey gül,
Qoyub həqiqəti-aləm, rahi-məcazə gedərlər[1]...

Yaxud:

...Xalın oxşar Həcərə, Zəmzəmə çahi-zənəxin,
Yeri vardır desələr qibleyi-islam sənə... (I, 556)

Seyid Əzim Şirvani zahid obrazında ümumiləşdirdiyi ruhani silkini ona görə tənqid edirdi ki, onlar tərki-dünyadırlar. Vaizlər, zahidlər gözəlin məhəbbətindən doğan iztirablara tab gətirmək qüdrətindən məhrum olduqlarına görə nisyə xəyallar ardınca gedir, ibadət etməklə huri vüsalına nail olmaq istəyirlər. Şair onları maddi aləmin – ana yurdun gözəlliklərindən bəhrələnə bilmədiklərinə görə tənqid və istehza hədəfinə çevirirdi:

Ey zahidi-xudbin, bilirəm ki, hünərin yox,
Meydani məhəbbət tərəfə bir güzərin yox,

---

[1] S.Ə.Şirvani. Əsərləri. İki cilddə, I cild, Bakı, 1950, səh. 168

Mehrabdə əgləş ki, cigərdar degilsən,
Bu nari-qəmə yanmağa əsla cigərin yox.

Sən eylə pəri, hur xəyalilə ibadət,
Bəzmində ələnnəqd büti simbərin yox. (I, 116)

Şair Şamın başına dolanıb özünü oda yandıran Pərvanənin hərəkətini Həccə gedib Həcərin başına dolananların ziyarətindən "şərafətli" hesab edir. Ona görə ki, Pərvanə Şamı sevir. Onu yanmağa təbii hisslərin hökmü sövq edir. Həcc ziyarətini icra edənlər isə nisyə cənnət, abi-kövsər təmənnası, huri-qılman eşqi ilə dini ayinləri icra edirlər.

...Min Həccdən şərafəti əfzun olur, əgər
Şəmə dolanıban yana pərvanənin biri... (I, 582)

Seyid Əzimin tərki-dünyalara, quru ibadətçilərə qarşı çevrilmiş tənqidi dairəsi genişlənib ruhani aləminin müxtəlif məsələlərini əhatə edir. Şair onları başlıca olaraq riyakarlıqda ittiham edir. Dindarlar özlərini xalqa müqəddəs adam, dinin və şəriətin himayəçisi kimi nişan verirlər. Əslində isə hərəkətləri ilə əqidələri arasında dərin bir uçurum mövcuddur. Vaiz və axundların əba-qəbaları insanlara doğru yola istiqamətləndirmək üçün yox, eyiblərini, cinayətlərini ört-basdır etməkdən ötrüdür. Seyid Əzim qəzəllərinin birində buna bir-başa işarə edərək deyirdi:

Zahidin işi zahirdə əbadır və duadır,
Məlun kişidir, hiyləvü təzvir nihadı. (I, 622)

Şairə görə dini ayinlər, Quranın təlimi, şəriət qaydaları ruhanilərin əlində şəxsi həyatlarını təmin etməkdən ötrü qazanc mənbəyidir. Onlar xalqın xeyir-şərindən ancaq mənfəət gözləyirlər.

...Ayeyi-xəmr oxuyur, nəfini inkar qılır,
Tutduğu felini gör, verdigi mənasına bax.

Cənnətə getdi və ya duzəxə mürdə, nə qəmin,
İrsinə dik gözüvü, külçəvü halvasına bax.

İstəyir cənnəti zahid bu qədər hiylə ilə,
Əbləhin fikrini gör, dildə təmannasına bax... (I, 115)

Şairin fikrincə, nəinki əməlləri, hətta geyimləri, təsbihləri xalqı soymaq üçün qurulmuş tələdir. O, vətən və din qardaşlarını onlara aldanmamağa, hiylələrinin qurbanına çevrilməməyə çağıraraq yazırdı:

Könül, ta var əlində cami-mey səbhəşümar olma,
Riyayi-xəlqdir, billah, namaz əhlinə yar olma.

...Qurub təhtül-hənəkdən dam zahid, səbhədən danə,
Həzər, ey murği-dil, ol danəvü damə şikar olma.

İmamə ixtiyarın vermə, hərgiz uyma təkbirə,
Onun tək faili-muxtarsən, biixtiyar olma... (I, 42)

Seyid Əzim lirik növün digər müxəmməs, müsəddəs, müstəzad, tərkib-bənd, qəsidə, rübai və s. janrlarında da əsərlər yazmışdır. Şairin lirik irsinin forma əlvanlığına baxmayaraq onları vahid bir ideya-həyat eşqi, təbiət və insan gözəlliyinin tərənnümü, real hisslərin təsviri, dünyaya nikbin baxış, gələcəyə ümid və s. təbliği birləşdirirdi. Bu mənada real həyat məsələləri Seyid Əzim Şirvani lirikasının əsas məzmunu və məndəricəsini təşkil edir. Onun bütün ruhu insanın təbii və ictimai hüquqlarını məhdudlaşdıran rəsmi qanunlara, tərki-dünyalıq yayan dini-mistik təlimlərə qarşı çevrilmişdir.

* * *

Klassik şeir ənənələrini davam etmək sahəsində böyük yaradıcılıq uğurları qazanmasına baxmayaraq, Seyid Əzim istedadını kiçik lirik formalarla məhdudlaşdırmadı. Sosial və mədəni hadisələrin təsiri altında real həyat məsələlərinə yaxınlaşdıqca qüvvətli müasirlik duyğusuna malik olan şairdə ədəbi fəaliyyətinin birinci mərhələsində xüsusi aludəçilik göstərdiyi klassik şeir formalarına rəğbət azalırdı. XIX əsrin 70-ci illərinin ortalarında onda artıq müasir həyat məsələlərini əks etdirmək üçün yeni ədəbi formalara müraciət etmək haqqında qəti qənaət yarandı. O, “Əhibbanın ricası” şeirində qəzəlin ictimai məsələləri geniş miqyasda təsvir və təhlil etmək baxımından məhdud imkana malik olduğunu, artıq oxucuların zövqünü oxşamadığını bildirir və istedadını bu yolda əsər yazmağa sərf edənlərə ondan uzaqlaşmağı tövsiyə edərək yazırdı:

Nə olur, ey ədibi-əhli-cahan,
Edəsən pəndimi qəbul əlan,
Çəkəsən şiveyi-qəzəldən əl,
Qəzələ qoymayır qəzal məhəl... (II, 101)

Bunu nəzərə alan şair qələm yoldaşlarına “təriqi-digər tutmağı” məsləhət görürdü. Bu isə konkret olaraq həyatı geniş planda əks edən, fikrin sərbəst ifadəsinə kömək göstərən, sosial-etik məsələləri müzakirəyə qoymağa imkan verən lirik-epik janrlara müraciət etməkdən ibarət idi. Seyid Əzim ədəbi mövqeyini açıq şəkildə ifadə edərək yazırdı:

...Huşə gəl, mərdlik zəmanı deyil,
Dəxi bidərdlik zəmanı deyil.
Olma bikar, ol mübaşiri-kar,
Gərçi bimüştəri qalıb bazar.

Yox mətai-hünər xəridarı,
Saldı gərdun kəsadə bazarı.
Demə əşar, rəsmi-şeri unut,
İndi sən bir təriqi-digər tut... (II, 101)

Belə aydın ədəbi mövqedən irəli gələrək XIX əsrin 70-ci illərindən etibarən Seyid Əzimin yaradıcılığında ciddi yeniləşmə və müasirləşmə prosesi başlanır. O, əvvəlki yaradıcılıq ənənələrini davam etməklə yanaşı, öyüdlər, nəsihətlər, mənzum və mənsur hekayələr, təmsillər, satirik şeirlər yazır, bədii tərcümə ilə məşğul olur. "Əkinçi", "Ziya" ("Ziyayi-Qafqaziyyə"), "Kəşkül" kimi dövri mətbuat səhifələrində zəmanəsinin müxtəlif məsələlərinə aid publisist yazılar dərc etdirir. Yaradıcılığında satirik və didaktik pafos üstünlük təşkil edir.

Seyid Əzim Şirvani Azərbaycan maarifçilik məfkurəsinin demokratik cəbhəsinə mənsub idi. M.F.Axundov, H.Zərdabi, Əhsənül-Qəvaid, Məhbus Dərbəndi, Nəcəf bəy Vəzirov, Əsgər ağa Gorani, Məhəmmədtağı Əlizadə və b. kimi, o da müstəmləkə şəraitində, dini fanatizmin təzyiqi altında yaşayan Azərbaycan xalqının fiziki və mənəvi əsarətdən qurtuluş yolunu maariflənməkdə, orta əsrlərdən qalma zərərli şüur və düşüncə tərzindən uzaqlaşmaqda, elmi-texniki biliklərə yiyələnməkdə, cəmiyyəti çürüdən tüfeyli təbəqələrin kökünü kəsməkdə görürdü. O, Qafqaz əhlinə xitab kimi yazıb H.Zərdabiyə göndərdiyi yaradıcılıq proqramı sayıla bilən bir məktubda dünyagörüşünün bu cəhətini ifadə edərək yazırdı:

...Günü gündən zəlilü xar olduq.
Möhnətü qüssəyə düçar olduq.
Bu qədər dərd kim, olur hadis,
Ona bielmlik olur bais.
Bir bəladır bu dərdi-nadani –
Ki, onun elm olubdu dərmani... (II, 117)

Seyid Əzim xalqının xoşbəxt gələcəyi haqqında gözəl arzular bəsləyir və onu dünyanın maariflənmiş və tərəqqi etmiş millətlərindən biri kimi görmək istəyirdi. Ona görə şair həmvətənlərini geri qoyan səbəbləri araşdırıb üzə çıxarmaq və onları islah etmək yolları haqqında əməli təkliflər irəli sürürdü:

...Bu təəccübdür, ey güruhi-bəşər,
Bir kişi yatsa, naxoş olsa əgər,
Axtarır bir təbibi-danadil,
Ta ki, səhhət ola ona hasil.
...İndi naxoşdu milləti-islam,

Ona lazımdır eyləmək əncam.
Dərdimizdir bu dərdi-nadanlıq –
Ki, tutubdur bizi pərişanlıq.
Qeyrilər etdilər tərəqqiyi-tam,
Qaldı zillətdə firqeyi-islam... (II, 118)

Müdrik şair xalqın düçar olduğu bəla və bədbəxtliklərin bir səbəbini də ruhanilərin fəaliyyətində, onların təbliğ etdikləri dini təlimin gərəksizliyində, başlıcası isə müasir həyatın tələblərindən uzaq düşməsində görürdü. Onun fikrincə, müasir cəmiyyətin strukturunda əsas yeri təşkil edən ruhanilər bütün qüvvələrini əliqabarlı kütləni soymaqdan ötrü səfərbər etmişlər. Bu isə xalqın iqtisadi və mənəvi yoxsulluğuna səbəb olmuşdur.

...Hər vilayətdə var beş-on kəsəbə,
Əlli min seyyidü axund, tələbə,
Əlli dərviş, əlli mərsiyəxan,
Hamının sözləri tamam yalan.
Əlli min suxtə, əlli min sail,
Əlli min hoqqabazi-naqabil,
Hamının fikri xəlqi soymaqdır,
Quru yerdə bu xəlqi qoymaqdır... (II, 118)

Seyid Əzim həmvətənlərinin fiziki və mənəvi zülmün müxtəlif formalarına məruz qalıb bir ovuc imtiyazlı təbəqə tərəfindən insafsızcasına istismar edilmələrinin səbəbini birinci növbədə onların müasir elmi tərəqqidən kənarda, vaxtı ötmüş məişət qaydalarının buxovunda əsir olmasında görürdü. Şair doğma xalqının müasir dünyanın inkişaf ahənginə qoşulmasını onun tərəqqisi üçün əsas amil hesab edərək yazırdı:

...İndi işlər çıxıbdır asanə,
Rəsmi-dünya düşübdü samanə,
Tapıb övzai-masiva təğyir,
Goyə çıxmağa xalq edib tədbir.
Paraxod oldu gəştiyi-yelkan,
Özgə samanə düşdü xəlqi-cahan.
Leyk biz bilmənük göz açmaği,
Köhnə işlərdə qalmışıq baqi.
Babamızdan nə görmüşük əvvəl,
Dəxi ondan səvayə olmaz əməl. (II, 118-119)

* * *

Şairin 1877-ci ilin yanvarında M.F.Axundovun H.Zərdabiyə ünvanlanan "Bizim əzizimiz və gözümüzün işığı" müraciətilə "Əkinçi"də müsəlman xalqlarının tərəqqi yolları haqqında başlanan müzakirəyə qoşulması, feodalizmdən qalma, müasir əhəmiyyətini itirən ictimai və mədəni təsisatları-maarifi, məktəbi-ədəbiyyatı, təlim-tərbiyə metodlarını kəskin tənqidə məruz qoyması əski cəmiyyəti islah edib kökündən dəyişmək və onu demokratik əsaslar üzərində yenidən qurmaq amalı ilə birbaşa bağlı idi.

...Hər vilayətdə var beş-on məktəb,
Edirik kəsb onda elmü-ədəb.
Məktəbin fərşi altı köhnə həsir,
Neçə ətfali-müztər onda əsir.
Dərsimüzdü kitabi-"Gürbəvü muş",
"Nəql-həmdunə", "Qisseyi-Xərguş".
Oxuruq, çox tərəqqi etsək əgər,
Cümlə "Tarixi-Nadi"ri əzbər... (II, 122-123)

Bir maarifçi olaraq köhnəni tənqid atəşinə tutan Seyid Əzim eyni zamanda onun islahı və yenidən qurulması yollarını da nişan verirdi. M.F.Axundovla eyni mövqedən çıxış edən maarifçi şair müsəlmanların iqtisadi tənəzzülünü və maddi yoxsulluğunu onların mədəni geriliyinin başlıca səbəbi hesab edir, qurtuluş yolunu müasir tərəqqi vasitələrini hazırlamaqda görürdü.

...Deyəcəksən ki, ey qərini-ədəb,
Bəs gəlin tazədən açaq məktəb.
Biz bu əmrə görək ki, ey xoşnam,
Hansı qüdrətlə eyləyək iqdam?
Pulumuz varmı ol sərəncamə,
Ta yetişsin fəqirlər kamə?
Əhli-islam eyləyibdi vəfat,
Dəxi müşkil tapa bu qövm həyat.
Məgər ol Əsgəri-Gorani gələ,
Neçə məktəb gələ dəxi əmələ.
Vəzirov bəlkə eyləyə imdad,
Qıla bu qövmi elm üçün irşad.
Açа onlar da mən kimi məktəb,
Çəkələr ruzü şəb əzabü təəb... (II, 123)

* * *

Müxtəlif tipli siyasi-ictimai, iqtisadi və mədəni hadisələrin təsiri altında baxışlarında ciddi təkamül yaranan Seyid Əzim "Gətirmək tazə üslubə gərəkdir köhnə dünyani" (II, 193) qənaətinə gəldi. Uzun illər gözəlliyi tərənnüm edən şairdə sosial gerçəkliyin eybəcər və kələ-kötür təriflərinin təsvirinə meyl qeyri-adi dərəcədə qüvvətləndi. Onun qəzəl, müxəmməs, tərkibbənd, rübai və s. janrlarda qələmə aldığı əsərlərdə düşkün əxlaq normalarına, ruhani riyakarlığına, mövhumi təsəvvürlərə, dini etiqadlara qarşı çevrilmiş tənqidi tədriclə kəskinləşib miqyasını genişləndirdi və müstəqil satirik istiqamətə çevrildi. Bir zaman laübali və rindanə şeirlər yazan şairin yaradıcılığında ictimai yaralar təşrih olunmağa başladı. O, cəmiyyətin müxtəlif təbəqələrinin maddi və mənəvi həyatında təzahür edən nöqsan və qüsurları, çirkin əməlləri cəsarətlə satirasına hədəf etdi. İsmayıl bəy Qaspirinskinin dediyi kimi "şeir və qəzəlləri nə mərtəbədə nazik və lətafətli isə həcv və gülgüləri dəxi şu nisbətdə ağu və ötkündür, ya ki, tatlı bir zəhərdir. Riyakarlığı, rüşvətçiliyi, səranlığı, mənafqanlığı qılınc doğrar, kəsər kimi əbyat və təmsilatı ilə yaxıb yandırmışdır".

Seyid Əzim satiralarının mövzu dairəsi geniş, tənqid hədəfləri əlvandı. Çarizmin ucqar Azərbaycanda yeritdiyi mənfur müstəmləkəçilik siyasəti, dini və milli fərqləri qabardıb qızışdırmaq cəhdləri, yaramaz idarə üsulu, rəsmi hökumət qanunlarını, fərman və tədbirlərini ölkədə rüşvətxorluq mənbəyinə çevirən dövlət məmurları və onlarla əlbir olub xalqı soyan nüfuzlu bəylər, pul verib mövcud cəmiyyətin strukturunda layiq olmadığı yeri tutan və rəsmi imtiyazlardan bəhrələnən fırıldaqçı tacirlər, kənd hampaları ("Şirvanın təzə bəyləri haqqında", "Şamaxının təzə bəylərinin həcvi"), İslamın əsaslarını sarsıtmaq məqsədilə saxta dini təlim və təriqət yaradanlar və onlara biyət gətirənlər, ("Şamaxı babiləri haqqında"), dini əllərində fırıldaq vasitəsinə çevirib soyğunçuluq və əxlaqsızlıqla məşğul olan ruhanilər ("Abid əfəndinin həcvində", "Hümayini həcv", "Qazi Hacı Molla Məhəmməd Məlikkəndliyə"), saxta ayinlər icad edib avam kütlənin qanını tökməyə səbəb olan fanatik müsəlman ruhaniləri və korafəhm ziyalılar ("Quba təziyədarları və xeyməni qarət edənlərə", "Sultanov Hadiyə", "Həsən Qara Hadiyə"), istedadını heç bir ictimai əhəimyyəti olmayan mətləblərin təsvirinə, namuslu adamların təhqir olunmasına həsr edən şairlərin ("Abdulla bəy Asiyə", "Məhəmmədtağı Qümriyə cavab", "Məhəmməd ağa Cürmiyə"), hakim siniflərin və ruhanilərin zülm və istismarının təzyiqi altında siyasi düşüncəsi kütləşib nadana, cahilə çevrilən kəndli kütləsi ("Xan və dehqan", "Allaha rüşvət"), dini təhsilin və şəriət elmlərinin müasir dövr üçün faydasızlığı "Müctəhidin təhsildən qayıtması", "Cahil ata ilə alim oğul hekayəsi" və s. tənqidi əsas aparıcı yer tuturdu.

Seyid Əzim satiraları maarifçi məzmunlara malik idi. Şair müxtəlif təbəqələrin vəziyyətini təsvir edərkən onların düçar olduqları mənəvi böhranı, əxlaqi illətləri ön plana çəkir, bunları fəaliyyətinə "füqəra"nın – kəndli küt-

ləsinin, şəhər zəhmətkeşlərinin mənafeyi mövqeyindən çıxış edərək qiymət edirdi.

...Əhli-divanın işin şərh qılım bir neçə bab,
Şərhi itmamə yetişməz yazıla əlli kitab.
Füqəralər yanıban zülm oduna oldu kəbab,
Bir tərəfdən elədi zəlzələ Şirvanı xərab,
Bir tərəfdən də, bular aləmi viran elədi... (II, 18)

Seyid Əzim satiralarında mövzunu gerçəkliyin hansı səhnəsindən götürməsindən asılı olmayaraq bəla və qüsurların ictimai kökü araşdırılmır. Bütün eybəcərliklərin səbəbi ictimai quruluşda yox, naqis ağılda, əxlaqda, mənəviyyatda axtarılırdı. Şair "hər kəsin layiqi-əhvalını" təyin etmək üçün imperator fərmanı ilə tərtib edilmiş bəy komissiyasını həqiqəti üzə çıxarmaq haqqında içdikləri andı pozmaqda, xəyanət yolu tutmaqda, etimadsızlıq göstərməkdə ittiham edirdi.

...İçdilər and çlenlər hamsı Quranə,
Ta ki meyl etməyələr əyriliyə, böhtanə,
Hər kəsin layiqini şərh edələr mərdanə,
Bəylərin bəyliyi ta sabit ola divanə,
Xan, kimi bəy eləyib, ya kimi dərban elədi... (II, 14)

Nəfsinin əsirinə çevrilib, rüşvət almaqla hər "bisərüpa"ya yüksək imtiyaz verən və vilayətin silki nizamında hərc-mərclik yaradan bəy komissiyasının işini vətənə, xalqa xəyanət kimi dəyərləndirən şair yazırdı:

...Qaraqaş oğlu ki, heç bəy döyüdü, bəg dedilər,
Pul ki, gəldi araya, bardağa səhəng dedilər,
Kim ki, pul vermədi, – ol yazığa Bərmək dedilər,
Müxtəsər, eşşəyə at, ata da eşşək dedilər.
Bu eşşəklər yeyibən arpanı tüğyan elədi... (II, 14)

Qanunsuzluqdan, hərc-mərclikdən və mənəvi mirasdan qeyzə gələn şair bəy komissiyasının fəaliyyətini "at ölüb, itlərin oldu neçə gün bayramı", "yekə bəylərin", "alçaq bəylər"dən rüşvət almalarını "kühən atlar necə ki, arpa qapar eşşəkdən" kimi səciyyələndirirdi.

Seyid Əzim eyni mövqedən çarizmi yerlərdə təmsil edən məmurları da müstəmləkə rejimində yaşayan məzlum xalqı zülmə məruz qoyduqlarına, soyub taladıqlarına görə, tənqid edirdi. Şairə görə "sarı saqqallı naçalnik" qabiliyyətsizlik üzündən qorxaqlıq nümayiş etdirir, qanunlar qüvvədən düşür, ona görə də hər nadan onu təsir altında saxlaya bilir.

...Çünki çullarıdı, palanlardı onu hər eşşək... (II, 18)

“Mirovoy sudya” “şələ saqqalını” çifeyi-dünyadan ötrü tələyə çevirib, “bədzat əməl”lərlə məşğul olur. İsa bəy “fəsli-kitab” görmədiyi halda incinarlıq edir və xalqa “əzab” verir. Qanunların rüşvət, alqı-satqı vasitəsinə çevrildiyi belə bir mühitdə advokatlar hakim dairələrin nəzərində günahsız müqəssirə çevrilən kütlənin avamlığından istifadə edib, talançılığa daha da rəvac verirlər.

...Advokatlar demə, bu xəlq ilə manəndi-yağı,
Başı Fondilki, Haput orta, Ağacan ayağı,
Soydulər ərzəçinin qalmadı cismində yağı,
Yazıq Abdulla bəyin həm uduzuldu boyağı,
Həm özün soydü lotu, gör necə üryan elədi... (II, 17)

Satiralarında çarizmin, burjua-mülkədar cəmiyyətinin qanunlarını, əxlaq normalarını, adətlərini şiddətli tənqid atəşinə tutmasına baxmayaraq, Seyid Əzim mövcud siyasi quruluşu dəyişmək fikrinə gəlmirdi. O, islahatlar aparıb qanunları demokratikləşdirmək, xalq mənafeyinin xidmətinə vermək və əhalinin hüquqlarını müdafiə etmək ideyasını irəli sürürdü.

Ölkəni insaf və ədalət prinsipləri əsasında tərtib olunmuş qanunlarla şüar edən hakim arzulayan S.Ə.Şirvani keçmişi yad edir, Mustafa xanın hakimiyyəti illərini, yaranal “Yermolovun” səltənət mülkünü “təmir” etmək tədbirini, ən başlıcası “hər kəsin layiqi-əhvalını tibyan” etməsini təqdir edir. Pristav, köməkçi, kvartal və kazakın vilayətdə yaratdığı hərc-mərclikdən qəzəblənən şair xanlıqlar dövründə Şirvanda nümunəvi idarə üsulu yaradan Mustafa xanı həsrətlə yada salaraq yazırdı:

...Kül sənin başına Şirvan, əcəb oldun nadan –
Ki, sənə sahib olur, indi gəlib hər... atan,
Hanı əyyami-qədimin, hanı ol Mustafa xan –
Ki, çıxıb taxtına izzətlə edərdi divan!
Çərxi-zən qəhbə əcəb bizləri suzan elədi... (II, 17)

Vəhşi hərəkətləri şəriət qanunu kimi dəb salıb bidətə çevirən təziyədarları və onları müdafiə edən kapitan Sultanov və Həsən Qara Hadi kimilərini məhz nadanlıq nümayiş etdiklərinə, müsəlmanları yad millətlərin nəzərində gülüş hədəfinə çevirdiklərinə görə tənqid edirdi:

...Baş yarmağa, ox taxmağuva hiç sözüm yox,
Bir siz təki yox sahibi-cürət, köpək oğlu!

Amma ki, bu iş mərifət ilə ola xoşdur,
Biganə bizə etməyə töhmət, köpək oğlu!

Gözlər açılıb, iş dəyişib, haldır özgə,
Ancaq bizi tutmuş bu cihalət, köpək oğlu!

Bari elə olmaq ki, bizə gülməyə düşmən,
Hər şəhrdə var xarici millət, köpək oğlu!

Hər növ ilə ki, büdətə siz mürtəkib olduz,
Yazdıq onu naçar şəriət, köpək oğlu... (II, 32)

Maariflənməyi, müasirləşməyi cəmiyyətin yenidən qurulması işində başlıca şərt kimi qəbul edən şair Seyid Əzim satirasının tənqid atəşi bütövlükdə feodalizmə, onun müasirləşmək, demokratikləşmək, tərəqqi etmək yolunda buxova çevrilən sosial-mədəni təsisatlarına, kifsimiş şüur və düşüncə tərzinə, ömrünü yaşamış adət-ənənələrinə qarşı çevrilmişdi. Lakin şair yaradıcılıq imkanlarını təkcə bununla məhdudlaşdırmamışdı. Onun yaradıcılıq vəzifələrinə satira vasitəsilə əsaslarını sarsıtdığı feodalizmin xarabalıqları üzərində yeni bir cəmiyyət qurmaq uğrunda mübarizə də daxil idi. O bu amalı həyata keçirmək üçün didaktik pafosa malik əsərlərə, öyüd, nəsihət və s. müraciət etmişdi.

Seyid Əzim belə hesab edirdi ki, xalqı müasir elmi biliklərlə silahlandırmaq yolu ilə maarifçilərin "bəşəriyyətin cənnəti" kimi idealizə etdikləri gələcək xoşbəxt cəmiyyəti yaratmaq olar. Elə bir cəmiyyət ki, orada bütün vətəndaşların ahəngdar inkişafı təmin olunar. Orada zalımlar, müstəbidlər əməllərinin qəbahətini başa düşüb, məzlumlara və binəsiblərə zülm etməkdən əl çəkərlər. Bu cəmiyyətin üzvləri bəşər təfəkkürünün ən aşağı pilləsinin məhsulu sayılan dini təəssübkeşlik və irqçilik hisslərinin buxovundan qurtarıb, milli mənsubiyyətindən, dini etiqadından, dərisinin rəngindən asılı olmayaraq bütün insanları bir-birinə dost və qardaş sayarlar. Burada ayrı-ayrı fərdlərin dəyərini və ictimai mövqeyini onların əsil-nəsəbləri, hansı soydan olmaları, sərvətlərinin çoxluğu deyil, vətən və xalq qarşısında xidmətləri, əqli nailiyyətləri və şəxsi ləyaqətləri ilə müəyyənləşdirib qiymətləndirərlər. Təbii qanunların kodekslərinə əsaslanan bu cəmiyyət Seyid Əzim arzularına tamamilə uyğun idi. Şairin dünyagörüşünün bu xüsusiyyətləri və ümumiyyətlə, yaradıcılıq təkamülü öz bədii ifadəsini "Rəbiül-ətfal", "Tacül-kütub" məcmuələrində toplanmış əsərlərində tapmışdır.

"Rəbiül-ətfal" A.Bakıxanovun "Nəsihətnamə"sindən, M.Ş.Vazeh və İ.Qriqoryevin "Kitabi-türki"sindən, Mirzə Nəsrullah Didənin "Kitabül-nəsayeh"indən sonra Azərbaycan məktəblilərinin mütaliəsi və ümumiyyətlə, milli uşaq ədəbiyyatı yaratmaq sahəsində uğurlu təşəbbüsüdür. Bir sıra spesifik hallar nəzərə alınmasa, hətta, demək olar, uşaq ədəbiyyatımızın həqiqi tarixi "Rəbiül-ətfal"dan başlanır. Məcmuə bilavasitə uşaq mütaliəsinə ehtiyacı ödəmək məqsədilə yaranmışdır. Pedaqoji fəaliyyətinin ilk günlərindən şair uşaq mütaliəsi ilə əlaqədar ciddi çətinliklər qarşısında qalır. O, şagirdlərinin oxu

materialına ehtiyacını təmin etmək üçün sələflərinin yaradıcılığına müraciət edir. Lakin şairin axtarışları nəticəsiz qalır. O, "Rəbiül-ətfal"a yazdığı müqəddimədə bu barədə məlumat verərək bildirirdi ki, yazıçılar fikirlərini elə qəliz ifadələrlə bəyan ediblər ki, məktəbli uşaqlar onların dərkində çətinlik çəkirlər. Bunu nəzərə alan Seyid Əzim "Rəbiül-ətfal" əsərini yaradır. O bu məcmuəni tərtib edərkən Nizaminin "Sirlər xəzinəsi" və Sədinin "Bustan" əsərlərinin düzülüş prinsipinə əsaslanır.

Sələfləri kimi, o da məcmuəsini müstəqil hissələrə ayırmışdır. Klassik ədəbi ənənələrdən yaradıcı surətdə bəhrələnən şair hər bölməni oğluna müraciətlə etik məsələlərə dair baxışlarını ifadə edən öyüd və nəsihətlərlə başlayır. Burada onun əxlaqi görüşlərinin əsas tezisləri ifadə olunur. Hər bir öyüd və nəsihətin məzmununu və ideyasını həyatdan, Şərq, o cümlədən Azərbaycan şifahi və yazılı ədəbiyyatından ustalıqla seçilmiş süjetlər vasitəsilə əyaniləşdirir. Öyüd və nəsihətlərin münasib hekayə və təmsillərlə müşayiət olunması, birinin digərini tamamlaması fəsillərin məzmununa bir tamlıq və bütövlük aşılayır.

"Rəbiül-ətfal" məcmuəsinin tərtibi prinsipi onun janr və pafos əlvanlığını təmin etmişdir. Öyüd və nəsihətlərdə irəli sürülmüş fikirlərin uşaqlar tərəfindən mənimsənilməsini asanlaşdırmaq məqsədilə əyaniləşdirilməsi şairi mənzum hekayə, təmsil, hədis və s. ədəbi formalara, lirik, satirik və didaktik pafosa müraciət etməyə gətirib çıxarmışdır. Bu və ya başqa ideyanın müxtəlif ədəbi formalarda ifadəsi, didaktik pafosun tez-tez lirik və satirik pafosla əvəz olunması məcmuəni yeknəsəqlikdən qurtarır, uşaqlarda mütaliəyə marağı qüvvətləndirir.

Məcmuədə şairin üzləşdiyi başlıca məqsəd arzuladığı cəmiyyət üçün müasir ruhlu, əqli və əxlaqi cəhətdən kamil vətəndaş yetirib tərbiyə etməkdən ibarət idi.

Seyid Əzim "Rəbiül-ətfal"a yazdığı müqəddimədə göstərir ki, bir sıra faydalı mətləblər var, onların mənimsənilməsi bütün adamlar üçün vacibdir. Bunlar, əsasən, bəşəriyyətin əsrlər boyu sınaqdan çıxmış və sabitləşmiş əlaqə və münasibət formalarından, əxlaq normalarından ibarətdir. Milli fərqlərdən asılı olmayaraq, bunların əksəriyyəti bütün xalqlar üçün müştərəkdir. Seyid Əzim maarifçi görüşləri ilə yaxından səsləşən bu ideyaların təbliğindən ötrü Nizamidən üzü bəri Şərq ədəbiyyatı klassiklərinin sıx-sıx müraciət etdikləri öyüd və nəsihəti əlverişli saymışdı.

Şairin öyüd və nəsihətləri mövzularının rəngarəngliyi, problemlərinin çoxluğu baxımından diqqətəlayiqdir. Öyüd və nəsihətlərdə müxtəlif tipli əxlaqi məsələlər qoyulur, uşaqların diqqəti bəşəri və aktual səciyyə daşıyan rəngarəng problemlərə cəlb edilir. Bir qayda olaraq, şair öyüd və nəsihətlərini oğluna xitabla başlayır. Lakin həmişə şair oğlunu şərti mənada qələmə alır, onun simasında bütün gənclərə müraciət edir. Bu öyüd və nəsihətlərin mərkəzində zəngin həyat təcrübəsi qazanmış, dünyanın bərk-boşundan

çıxmış müdrik şair – atanın surəti dayanır. Bunlar moizə deyil, dünyagörmüş şairin uşaqlarla söhbət və mübahisələridir. O, sanki şirin və acı həyat təcrübələrindən çıxardığı nəticələri uşaqlarla bölür, onlara nəyin faydalı, nəyin zərərli olduğunu başa salır, yeniyetmələrə düzgün həyat yolu və vətəndaşlıq mövqeyi seçməkdə kömək edir.

S.Ə.Şirvaninin kiçik həmvətənlərinə aşılamaq istədiyi hissələrin ən başlıcası vətən sevgisidir. Vətəni sevmək, yurdsevərlik, elpərvərlik məfhumları Seyid Əzimin öyüd və nəsihətlərində ehtirasla təbliğ etdiyi ideyalardandır. Şair belə hesab edir ki, vətən müqəddəs məkandır. Onu sevmək hər bir vətəndaşın borcudur. Özünün və oğlunun Şamaxıda doğulduğunu iftixarla qeyd edən Seyid Əzim onu gözəllikdə gah Kəşmir, gah İsfahanla müqayisə edir, keçmişindən və mədəniyyət tarixinə verdiyi alim və şairlərdən söhbət açır və bu yolla uşaqlarda vətənpərvərlik qüruru hissini qüvvətləndirməyə çalışır.

...Hansı Şirvan, O gülsitani-qədim –
Konda* Şirvanşəhilər oldu müqim.
Nə Şəmaxi ki, onda İzzəddin
Nəzmdən zahir etdi sehri-mübin.
Məsqətür-rəsi-paki-Xaqani,
Hünərin Zülfüqari-bürrani.
Nə Şəmaxi ki, onda sübhü məsa
Verdi rüxsari-şeri-Bədr ziya... (II, 370)

Bir maarifçi kimi Seyid Əzim təbii hüquq nəzəriyyəsinin mövqeyində dururdu. Ona görə də şair hər cür dini və irqi təəssübkeşlik hisslərindən uzaq idi. O, belə hesab edirdi ki, insanlar anadan bərabər doğulurlar. Yetişdikləri yerin, iqlimin və mühitin təsiri altında onların rəngində, tərbiyəsində fərq olsa da, bu, adamların yüksək və alçaq irqdən olduqlarını söyləməyə əsas vermir. Belə aydın bir məntiqə söykənən şair uşaqlara millətçilik təəssübündən uzaqlaşmağı, bütün millətlərə qardaşlıq gözü ilə baxmağı tövsiyə edirdi:

...Demirəm mən gedən təriq ilə get,
Əqli tut, ol gözəl rəfiq ilə get.
Sənə bürhan deyil təriqi-pədər,
Gör nə yol getdi zadeyi-Azər.
Demirəm rus, ya müsəlman ol,
Hər nə olsan get, əhli-ürfan ol... (II, 375)

Şair fikirlərini bununla əsaslandırırdı ki, müxtəlif dillərə məxsus "boq", "tanrı", "xuda" ifadələri yalnız "Allah" məfhumunu ifadə edir. Sanki şair sual verib soruşur: Bir halda ki, belədir, insanların müxtəlif dinlərə, millətlərə, etiqadlara bölünmələrinə ehtiyac varmı? Seyid Əzim buna belə cavab verirdi:

---

* Ki onda

...Çatmayıb şərdən bizə bu xəbər –
Ki, ərəbdən siva dil oldu hədər.
Nə ərəbdir xuda, nə rum, nə zəng,
Nə həbəşdir, nə zəngbarü firəng.
Xah boq, xah tanrı, xah xuda
Birdi mənada, ey düri-yekta.
Ləfz edirsə ifadə mənanı,
Sərf edər əhli-mərifət anı... (II, 377)

Seyid Əzim gəncliyin xeyirxah müəllimi idi. Şair onların simasında gələcəkdə vətənin tərəqqisini və abadlığını, xalqın rifahını və mədəni yüksəlişini təmin edən əzəmətli bir qüvvə görürdü. Bununla yanaşı müdrik sənətkar yeniyetmələrə həyat məsələlərini, xalq işi uğrunda döyüş və mübarizə yollarını öyrənməyi də zəruri hesab edirdi. O, öyüd və nəsihətlərinin bir hissəsində məişət üçün faydalı olan məsələlərdən söhbət açır, onlara elmi biliklərə yiyələnməyi, müxtəlif dilləri öyrənməyi təkidlə tövsiyə edirdi. Bu baxımdan Seyid Əzimin rus dili və rus mədəniyyətinə yiyələnmək haqqında çağırışları daha müasir və aktual səslənirdi. O, başa düşürdü ki, hazırkı şəraitdə rus dilini, böyük Rusiyanın mədəni sərvətini bilməmək nəinki azərbaycanlıların siyasi mövqeyinə, mənəvi inkişafına, hətta iqtisadi həyat şəraitinin yüksəlişinə mənfi təsir göstərir. Ona görə şair gəncləri rus dilini öyrənməyə çağıraraq yazırdı:

...Cəhd qıl neməti-təmamə yetiş,
Elm təhsil qıl, məqamə yetiş.
Ey oğul, hər lisanə ol rağib,
Xassə ol rus elminə talib.
Onlara ehtiyacımız çoxdur,
Bilməsək dil, əlacımız yoxdur... (II. 377)

Seyid Əzimin öyüd və nəsihətlərində elmi biliklərə yiyələnməyin faydası, alimə və müəllimə hörmət, məzlumlara qayğı, qadına ehtiram, mənəvi təmizlik kimi keyfiyyətlər təbliğ, sadəlövhlük, cahillik, tüfeylilik, hiyləgərlik tənqid olunur.

Seyid Əzimin öyüd və nəsihətləri bədii cəhətdən də diqqəti xüsusi cəlb edir. Burada cansıxıcı moizədən, quru didaktizmdən əlamət yoxdur. Belinskinin sözləri ilə desək, bu öyüd və nəsihətlər "həyat və hərəkətlə dolu, canlı hissi hərəkətə malikdirlər". Burada şair qəlbinin bütün hərarəti ifadə olunmuşdur. Poetik fantaziyanın yüksəkliyi, şeriyyətin güclülüyü, vəzn oynaqlığı və şuxluğu, fikirlərin qüvvətli poetik vasitələrlə ifadəsi bunları quru mühakimədən, "soyuq əxlaqi təlimdən" xilas etmişdir.

"Rəbiül-ətfal"da mənzum hekayələr, təmsillər xüsusi yer tutur və məcmuənin əsas mündəricəsini təşkil edir. Bunlar yuxarıda qeyd etdiyim kimi,

öyüd və nəsihətlərdə irəli sürülmüş fikirlərin əyaniləşməsinə və ideyaca tamamlanması işinə xidmət göstərsə də, əslində onların hər birisi müstəqil mövzusu və konkret məzmunu, orijinal süjet-kompozisiya xüsusiyyətlərinə malik bitkin əsərlərdir.

S.Ə.Şirvani mənzum hekayələrində, ümumiyyətlə, bu dövrün ədəbiyyatına məxsus bir cəhət qabarıq müşahidə olunur, əsərlərin əksəri satirik və didaktik səciyyə daşıyır. Daha doğrusu, eyni əsərdə satira didaktika ilə paralel surətdə fəaliyyət göstərir. Maarifçilik fəlsəfəsinin xüsusiyyətlərindən irəli gələn bu cəhət müəllifin müsbət idealı ilə bağlı idi. Şair cəmiyyətin xəstə cəhətlərini tənqid etməklə yanaşı, onu yenidən qurmaq yollarını da göstərirdi.

Seyid Əzimin mənzum hekayələri mövzu baxımından rəngarəng idi. Ruhanilərin hiyləgərliyi, kəndlilərin hüquqsuzluğu, qadın əsarəti, pulun burjua-kapitalist cəmiyyətində pozucu rolu kimi məsələlər burada aparıcı motivdir. Lakin bütün bu rəngarəng problemləri ümumi bir cəhət – cəhalət, nadanlıq və mədəni geriliyin tənqidi birləşdirirdi. Şair "Əkinçi və xan", "Allaha rüşvət" mənzum hekayələrində əsrin son rübündə Azərbaycan həyatı üçün səciyyəvi bir mövzuya – kəndli məsələsinə müraciət etmişdir. Birinci hekayədə xan-rəiyyət münasibətləri əsas tənqid hədəfi idi. İllərlə xanların, bəylərin zülmü altında əzilib insan yerinə qoyulmayan kəndli onların söyüş və təhqirlərini "iltifat" hesab edir. Bu o kəndli idi ki, əsrin böyük siyasi xadimlərindən biri onun haqqında yazmışdı: "Dünyanın heç bir ölkəsində kəndlilər "azad edildikdən" sonra da Rusiyadakı qədər müflisləşməmiş, yoxsulluğa düçar olmamış, alçaldılmamış, təhqir olunmamışdılar". Bu baxımdan Seyid Əzimin yaratdığı kəndli surəti xeyli tipik idi. "Allaha rüşvət"də isə hakimlərə hər iri və xırda işdən ötrü rüşvət verən kəndlilər yağış yağdırmaq üçün Allaha da rüşvət verməyi qərara alırlar. Kəndli həyatından alınıb məharətlə ümumiləşdirilmiş bu epizodlar şairə gerilik və maarifsizlik üzündən vətəndaşların avam və nadan qaldıqlarını göstərməkdən ötrü lazım olmuşdu.

Seyid Əzimin mənzum hekayələrində ruhani həyatının müxtəlif istiqamətdən təsviri və tənqidi xüsusi yer tuturdu. Bu, birinci növbədə şairin mədəni həyat uğrunda mübarizəsi ilə bağlı məsələ idi. S.Ə.Şirvaninin "Hacı və molla əhvalatı" ("Köpəyə ehsan"), "Qarınqulu abid", "Dəli şeytan", "Qazi saqqalını yandırır", "Bəlx qazisi və xarrat" kimi mənzum hekayələrində əsas tənqid hədəfi din xadimlərinin acgözlüyü, tamahkarlığı, din və şəriəti alver vasitəsinə çevirmələridir. Şair tipik həyat hadisələri və surətləri vasitəsilə ruhaniliyin iç üzünü açır, xalqa düşmən olduqlarını göstərirdi. Bunlardan fərqli olaraq, "Ruhanilik təhsili", "Müctəhidin təhsildən qayıtması", "Elmsiz alim" kimi hekayələrdə o, qabaqcıl ideyaların və ictimai fikirlərin mövqeyindən çıxış edir, ruhaniləri xalqın tərəqqisi və irəliləyişinə yardım edə bilməməkdə təqsirləndirir. Təkcə ona görə yox ki, din xadimləri, ümumiyyətlə, xalqın tərəqqisinə düşmən idilər, bir də ona görə ki, onların öyrəndikləri elmlər köhnə idi, zəmanənin tələbləri ilə səsləşə bilmirdi. Zəhmətkeş kütlənin qanından

çəkilən pulun hesabına Şərqin dini mərkəzlərində təhsil almış ruhanilər həmvətənlərinə faydalı bir şey verə bilmirdilər. Çünki bu təhsil sistemi köhnə və yaramaz idi.

...Tutalım elmə olmusan vasil,
Bizə bu elmdən nədir hasil?..
...Hanı islam üçün sərəncamın?
Yerə girsin o müctəhid namın!.. (II, 400–401)

deyən şair şəriət adamlarını müasir tərəqqi yollarına və vasitələrinə düşmən mövqedə durmaqda ittiham edirdi.

Seyid Əzimin didaktik əsərləri arasında özündə əlli mənsur miniatür hekayəni birləşdirən "Tacül-kütub" adlı digər bir məcmuə də vardır

Məcmuənin qarşısında duran konkret vəzifə uşaqların şüuruna və ağlına təsir göstərmək yolu ilə onlara mənimsənilməsi zəruri olan bir sıra etik-əxlaqi keyfiyyətləri aşılamaq və ümumbəşəri ruhda tərbiyə olunmalarını təmin etməkdən ibarətdir. Bu məqsəd buradakı hekayələrin spesifikasını müəyyənləşdirmişdir. Belə ki, bu hekayələrdə müəllifin bütün diqqəti bu və ya başqa əxlaqi-didaktik fikrin oxucuya çatdırılması məsələsi üzərində toplanır. Süjet – hadisələrin inkişafı, qəhrəmanların qarşılıqlı münasibəti elə qurulur ki, onlar birbaşa əxlaqi fikrin əyaniləşməsinə, xeyirxahlığın bədxahlıq üzərində qələbəsinin təmin olunmasına xidmət edir. Beləliklə, hər bir hekayənin məzmunundan qüvvətli təsir gücünə malik bir əxlaqi ideya doğur.

Bu hekayələrdə, bir qayda olaraq, Seyid Əzim mövzudan ötrü tarixi-əfsanəvi şəxsiyyətlərin, yoxsul və binəsib adamların həyatına müraciət edir. O, elə həyati və ibrətamiz epizodlar seçir ki, bunların vasitəsilə oxucuların hissinə təsir göstərməyə, mərhəmət, xeyirxahlıq duyğularını oyatmağa nail olur. Bu vəzifəni həyata keçirmək üçün Seyid Əzim tarixi-əfsanəvi şəxsiyyətlərin həyatına müraciət etməyi daha üstün tutur. Nuşirəvan və onun vəziri Büzürgmehr, Sultan Mahmud Qəznəvi, İskəndər Zülqərneyn, Harunər-Rəşid, Hatəm Tai, Ərəstun, Əflatun, Məmun və b. onun hekayələrinin mühüm bir qisminin qəhrəmanlarıdır. Şübhəsiz, şair tarixi şəxsiyyətlərin və əfsanəvi qəhrəmanların həyatına müraciət etməklə heç də onları idealizə etmək məqsədi izləmirdi. O, adları çəkilən şəxsiyyətlərin həyatından elə epizodlar seçib təsvir edirdi ki, onlardan bu gün üçün əxlaq və ibrət dərsi hasil olsun. Seyid Əzim onların dili ilə ölkənin abadlığına qayğı ("Nuşirəvan və şikar", "Nuşirəvan və iki bayquş"), məzlumlara mərhəmət ("İskəndər və vəzir", "Çin padşahının İskəndərdən sualı", "Nuşirəvan əsrində..."), alicənablıq ("Harunər-Rəşid və bağban", "Bir padşahi-dərvişdust...") təbliğ edir. "Tacülkütub"dəki hekayələrdə cəsarət, diribaşlıq, dostluqda sədaqət, etibar ən yaxşı insani keyfiyyət kimi təqdir və tərənnüm olunur. Bu baxımdan "Sail və həkim", "Korun hekayəsi", "Padşah və şair" və b. maraqlıdır.

Seyid Əzim hekayələrində xalq hikməti və yumorunun ən yaxşı xüsusiyyətləri əks olunmuşdur. Bunlar uşaqların əqli cəhətdən yetkin, mənəviyyatca sağlam, şən və nikbin yetişməsi işinə müsbət təsir göstərir.

Seyid Əzim uşaqlara məxsus əsərlərini yaradarkən yaxşı bələd olduğu Şərq ədəbiyyatından bol-bol bəhrələnmişdir. O, təbdil, iqtibas və tərcümə etmək yolu ilə ərəb, fars və türk ədəbiyyatından azərbaycanlı uşaqların mütaliəsinə xeyli əsər daxil etmişdi. Bu nümunələr "Rəbiül-ətfal" və "Tacül-kütub"da əksər hallarda ayrı-ayrı öyüd və nəsihətlərin məzmununa uyğunlaşdırılaraq, müəllifi göstərilmədən verilmişdir. Bunlardan başqa şairin bilavasitə uşaqlar üçün nəzərdə tutulmuş müstəqil tərcümələri də vardır. Bu baxımdan İran xalq ədəbiyyatı nümunəsi – "Bəxtiyarnamə" dastanı və XIII əsrdə yaşamış məşhur fars-tacik şairi Übeyd Zəkaninin "Siçan və pişik dastanı" diqqətəlayiqdir. "Siçan və pişik dastanı"nda alleqorik şəkildə orta əsr saray çəkişmələri və feodal müharibələri tənqid olunur. Dastanın əyləncəli məzmunu, münaqişənin gərginliyi, xüsusilə siçan və pişiyin şəxsləndirilməsi uşaq mütaliəsinə verilən tələblər baxımından maraqlı idi.

* * *

Seyid Əzim böyük ictimai xadim, millət təəssübü və qeyrəti çəkən işıqlı şəxsiyyətlərin, maarif və elm adamlarının məsləkdaşı və əqidə dostu, qatillərin, nadanların, riyakarların düşməni, şairlərin "sərvəri" idi. O, Şamaxı kimi inzibati və iqtisadi cəhətdən tənəzzülə uğramış əyalət şəhərində yaşamasına baxmayaraq ölkədə gedən ictimai-mədəni prosesləri izləyirdi. Firudin bəy Köçərlinin dediyi kimi, "öz zəmanəsinin hər bir həyati hadisələrinə və məsələsinə çox tez cavab verirdi"[1]. Bu isə öz növbəsində şairin yaradıcılığında epistolyar janrın inkişafı üçün zəmin hazırlamışdır.

Məktub, ümumiyyətlə, maarifçi, sənətkarların seçdiyi və sıx-sıx müraciət etdikləri ədəbi forma idi. XIX əsrin birinci yarısında şairlər, xüsusilə, Q.Zakir və M.F.Axundov geniş miqyasda istifadə etmişdirlər. Əsrin 70-80-cı illərində sosial həyatın mənzərəsi gərginləşib fikir mübadiləsinə ciddi tələbat yarananda Seyid Əzim epistolyar janrın imkanlarından istifadə etməyə başlamışdı. Məktublar Həsən bəy Zərdabi başda olmaqla Azərbaycanın müxtəlif məntəqələrində yaşayan tanınmış adamlara, şairlərə, naşirlərə, məmurlara, mülkədarlara ünvanlanmışdı. Şairin mən aləmini birbaşa əks edən bu məktublarda əsrin nəbzi döyünür, iqtisadi, mədəni və ədəbi proseslər haqqında zəngin məlumat verir. Məktubların mövzusu əlvan, problemləri rəngarəng idi. Lakin təsvir edilən bütün məsələlərin mərkəzində müəllifin həyatı və şəxsiyyəti dururdu. Bu mənada onlar bütöv halda avtobioqrafik səciyyə daşıyır. Məktublarda maddi ehtiyac məngənəsində sıxılıb əzab çəkən, əhli-əyal arasında şəriəndə, dost-aşna qarşısında xəcil olan şairin iztirabları qabarıq şəkildə ifadə olunmuşdur. Bu baxımdan "Həsən bəy Həbibbəyova" ünvanlanmış məktub diqqəti xüsusi cəlb edir.

---

[1] F.Köçərli. Seçilmiş əsərləri. Bakı, 1963, səh. 74.

...Evimiz bir, iki, üç həftə çörəksiz qaldı,
Gah bişirdik noxudu, gah yedik lobyani.
Qanını şişəyə tutdu fələk ol tifllərin
Ac qalıb qaçdı uşaqlar dodağının qani.
Gecələr nəql dedim körpə uşaqlarım üçün,
Nisyə sözdən nə bitər, çeynədilər yorğani...
...Bir meşok un tələb etdim ki, əta eyləyəsiz,
Qurtaram ta qəm əlindən bu dili-virani.
Gah mənə yarma həvalə elədin, gah kəpək –
Ki, yeməzdi onu ac qalsa yüz il, moltani... (II, 223-225)

Lakin müasirlərinin şairin aclıqla imtahana çəkməklərinə baxmayaraq o, qürurunu nəinki sındırmır, əksinə, imtiyaz və var-dövlət sahiblərinə meydan oxuyur, hər vəchlə onlardan üstün olduğunu nümayiş edir.

...Üstümü unnu görüb, sanma dəyirmançı məni,
Aç bəsirət gözüvü, ləli xəzəfdən tani!
Gərçi zahirdə fəqirəmsə, qənidir təbim,
Bu gədalıqda pəsənd eyləmənəm sultani!
"Fəqr fəxrimdü" o gündən ki, deyib peyğəmbər,
Bilmənim zərrəcə dünyanı və mafihani.
Mən ki, ənqa kimi bir qafi-qənaətdi yerim,
Neylirəm cifeyi-rəmz ilə belə dünyani?
Kişi namərd ətəyin tutmayıb, ölmək xoşdur,
Çünki namərddə yox bəzlü əta imkani.
Mən səni mərd bilib xidmətüvə gəlmiş idim.
Fərz bildim ki, Həsən bəydə olur bəy qani... (II, 225)

Seyid Əzim ona bir sıra sifətlər istinad verib həcv edən Məhəmməd ağa Cürmiyə məktubunda müftəxor bəylərdən, ruhanilərdən, məmurlardan fərqli olaraq zəhmət çəkib halal çörək qazanmasından iftixarla söhbət açaraq yazırdı:

...Zahirən seyyidəm, əmma nə o seyyiddən kim,
Xüms alam, mali-inam, yox buna imkan, Cürmi.
Deyiləm müftəxori-garkəsi-murdartələb,
Mənə öz rəncim olub vasiteyi-nan, Cürmi.
Sənətim bir neçə ətfala olubdur təlim,
Açmışam sahəti-Şirvanda dəbistan, Cürmi...
...Seyyidəm gərçi, bu seyyidliyə yoxdur fəxrim,
Şərt ismətdir ola taəti-yəzdan, Cürmi... (II, 144-145)

Seyid Əzim Şirvaninin qəbir daşı üzərində belə bir epitafiya var:

...Mövti-cismani ilə sanma mənim ölməgimi,
Seyida, ölmənəm, aləmdə səsim var mənim. (I, 399)

Bu, şairin məhəbbət mövzusunda yazdığı yüzlərlə qəzəldən birinin son beytidir. Lakin bu təsadüfi, gəlişigözəl seçilməmişdir. Burada onun öz sənətinin ictimai dəyərinə, bədii sanbalına, bir-birini əvəz edən nəsillərin mübarizəsinə, həmvətənlərinin tərbiyəsi işinə yaxından yardım edə biləcəyinə dərin inamı ifadə olunmuşdur. Bu nikbin əhval-ruhiyyə isə onun yaradıcılığının bəşəri mahiyyətindən, bütün dövrlər üçün müasir səslənən məzmunundan, mündəricəsindən doğmuşdur. Seyid Əzim inanırdı ki, onun siyasi əqidəsindən, dini etiqadından, irqindən asılı olmayaraq bütün insanları qardaşlığa səsləməsi, mənəvi təmizlik, sosial ədalət, xeyirxahlıq kimi nəcib fikirləri, sülh və əmin-amanlığı təbliğ etməsi, xalqın qanını soran “sosial həşəratları”, “əmmaməli jandarmları” tənqid atəşinə tutub, onlara qarşı mübarizənin zəruriliyi ideyasını məzlumların zehninə çatdırması, ictimai tərəqqi yolunda maneəyə çevirən vətən və millət xainlərini odlu qələmin hədəfinə çevirməsi gələcək nəsillər tərəfindən təqdir olunub alqışlanacaqdır. Çünki o öz fəaliyyəti, “köhnə dünyanı” dəyişmək uğrunda mübarizəsi ilə zəhmətkeş kütlənin yaxşı həyat haqqında arzularının xəyaldan həqiqətə çevrilməsi işinə xidmət göstərmişdir.

Seyid Əzim Şirvani vətəni doğma Azərbaycanda gec-tez xoşbəxt bir cəmiyyətin qurulacağına dərin inam bəsləyirdi. Ona görə də o üzünü gələcəkdə yaradılacaq yeni cəmiyyətin üzvlərinə tutub bu yolda döyüşən, lakin arzusu ürəyində qalıb həsrətlə ölən fədailərdən biri kimi məsud anlarda onu da yad etmələrini xahiş edir, hər misrasında və hər sətrində ürəyinin döyüntüləri eşidilən əsərlərini oxuyub bəhrələnmələrini məsləhət görürdü:

...Ol zaman kim, bu dövreyi-əflak,
Çürüdüb eyləyər vücudumu xak.
Oxuyanlar həqiri yad edələr,
Ruhumu qəbr evində şad edələr.
Gələcək aləmə çox əhli-məzaq,
Olacaqlar vücuduma müştaq.
Deyəcəklər ki, heyif Seyyidi-zar,
Oldu Şirvan ara qəribəməzar.
Kaş olaydı zəmanəmizdə bizim,
Bəzmi-cəngü çəğanəmizdə bizim!
Ey gələn ruzigarə növrəslər,
Qaşları qövs tək müqəvvəslər,
Sizlərə sərbəsər səlamım var,
Olmasam da özüm, kəlamım var.
Oxuyun şerimi qılın yadım,
Şad olsun bu ruhi-naşadım... (II, 10)

Əziz oxucular! Ehtiram əlaməti olaraq böyük şairin vəsiyyətinə əməl edib, əsərlərini oxuyun. Bu sizin kamilləşməyinizə, əqli və mənəvi cəhətdən zənginləşməyinizə yaxından kömək edər. Onu da xatırladım ki, siz əsərləri oxuyarkən bu gün üçün səciyyəvi olmayan, vaxtı ötmüş, artıq köhnəlmiş mətləblərə də rast gələrsiniz. Bunların təsirinə düşməyin. Amma yadda saxlayın ki, bu əsərlər Azərbaycanda feodalizmin dağılmağa, burjua-kapitalist münasibətlərinin formalaşmağa başladığı ziddiyyətli bir dövrün məhsuludur. Xalqımızın tarixində keçilmiş bir mərhələ kimi sizin bunlara bələd olmağınız da vacibdir.

"Seçilmiş əsərlər" Seyid Əzim Şirvaninin Azərbaycan EA Nizami adına Ədəbiyyat İnstitutu tərəfindən hazırlanmış üç cildlik "Əsərlər"inin (tərtibçi: filologiya elmləri namizədi Süleyman Rüstəmov, redaktor: Azərbaycan MEA müxbir üzvü Əziz Mirəhmədov) mətni əsasında tərtib edilmişdir. Bu nəşrdə müşahidə edilən yanlışlıqlar şairin "Divanı"nın 1895-ci il Təbriz çapı əsasında dəqiqləşdirilmişdir.

**Xeyrulla Məmmədov**
*filologiya elmləri doktoru, professor*

# Qəzəllər

* * *

Gecə gördüm səni, ey afəti-dövran, yuxuda –
Ki, edərdin mənə yüz lütfi-firavan yuxuda.

Görmüşəm ləlüvi, lazımdı tökülsün qanım,
Etibar olmaz əgərçi görələr qan yuxuda.

Zahirən abi-bəqayə yetəcək xəstə könül
Kim, bilibdir dəhənin sirrini pinhan yuxuda.

Nola ləlin görübən zövq ilə xəndan olsam,
Rəsmdir şad olu hər kim ola giryan yuxuda.

Var ümidim ola cəmiyyəti-vəslin məqdur
Ki, qara zülfüvi göz gördü pərişan yuxuda.

Gecə gördükdə səfayi-rüxün, ey kəbeyi-hüsn.
Kaş olaydım, dolanıb başuva, qurban yuxuda.

Seyyidi-zar görüb vəslüvi bidar olmuş,
Bir gədadır ki, görüb özünü sultan yuxuda.

* * *

Olmasaydı qəmi-eşqin dili-viranımda,
Saxlamazdım onu bu izzət ilə yanımda.

O qara xalı mənə versələr qanın içərəm,
Nə üçün mənzil edib arizi-cananımda.

Tutanı müshəfi-rüxsarüvi ol kafər xət,
Görünür gör nə xələllər mənim iymanımda.

Eyləməz aşiqi bir lütf ilə xürrəm, ya rəb,
Bu nə rəftardır ol sərvi-xuramanımda?

Düşəni xublərin könlümə fikri, Seyyid,
Əlli Yusif tapılır külbeyi-əhzanımda.

* * *

Xoşa ol aşiqə kim məclisində yarı ola,
Visali-yardə fərxəndə ruzigarı ola.

Neçə rəfiqi-müvafiqlə əgləşib içə mey,
Nə kəsri məclisi-meydən, nə intizarı ola.

Şərabə olmasa da gərçi nəqd simü zəri,
Şərabxanədə bari bir etibarı ola.

Bu gunə qoymaz idim, zülfüvə əsir olsun,
Əgər əlimdə dili-zarın ixtiyarı ola.

İlahi, bülbülə olsun həmişə gül həmdəm!
Müdam o xəstədilin gülşəni, baharı ola.

Mənim tək olmaya məhrum gülüzarından,
Nə qüssədən ürəgi qan, nə xar xarı ola.

Behiştə meyl eləməz, Seyyidin əgər, ey gül,
Yanında sən kimi bir yari-gülüzarı ola.

* * *

Can nə lazımdır, əgər mənzuri-canan olmasa,
Bəsdi cananın xəyalı, qəm degil, can olmasa.

Nəfsi-əmmarə edər tərğib xəlqi zillətə,
Meyli-üsyan etməz idi kimsə şeytan olmasa.

Ey könül, daim elə şeytani-insidən həzər,
Küfrdə Fironi gör, qalmazdı Haman olmasa.

Məcməi-əhli-dil olmazdı pərişan dəhrdə,
Gər səbadən türreyi-tarın pərişan olmasa.

Sureyi-Vəlleyl zülfündür, yüzün Vəşşəmsdir,
Qəm degil aləmdə bundan qeyri quran olmasa.

Seyyida, iyman gətir rüxsari-yarə, bil yəqin,
Hər əməl etsən qəbul olmaz gər iyman olmasa.

* * *

Güzərin düşsə dəri-dilbərə, ey badi-səba,
Yetir ərzim o güli-əhmərə, ey badi-səba!

Güli-cəfər kimi rəngim saralıb firqətdən,
De bu halı o güli-cəfərə, ey badi səba!

Təlxkam olduğumu zəhri-qəmi-hicrindən,
Ərzi-hal et o ləbi-şəkkərə, ey badi-səba!

Tabdən saldı kətan tək bu dili-bitabı,
Neyləmişdim o məhi-ənvərə, ey badi-səba?!

Peykərim peykəri-Cövza kimi, gör, oldu dü nim,
Ver xəbər ol büti-məhpeykərə, ey badi-səba!

Bu qara gün ki, mənim başıma hicrində gəlib,
Həq nəsib eyləməsin kafərə, ey badi-səba!

Lalə tək daği-dili-sineyi-suzanımı gör,
Ver xəbər sünbülü susənbərə, ey badi-səba!

Bu Məhəmməd elədi Seyyidi-biyarı həlak,
Ərz qıl rövzeyi-peyğəmbərə, ey badi-səba!

* * *

İkram edər o gül mənə əğyar yanında,
Ta etsin özün sevgili hər xar yanında.

Məqsud bu kim, mən olam azürdə, rəqibi
Əgləşdirə ol yari-dilazar, yanında.

Sordum ki, rəqib ilə oturmaq nədir, ey şux,
Güldü, dedi: gül daim olur xar yanında.

Şadəm ki, gözün fikridi peyvəstə könüldə,
Xoşdur ki, təbibi ola bimar yanında.

Hər xar nə versin ərəqi-ruyüvə qiymət
Kim, qədri gülabın olur əttar yanında.

Haşa ki, güli-tər ola rüxsarüvə nisbət,
Gül xarə dönər ol rüxi-gülnar yanında.

Gər ol sənəmin zülfi qəmindən ölə Seyyid,
Dəfn eylədin ol sahibi-zünnar yanında.

* * *

Gül qönçəlikdə gərçi olur xarə aşina,
Açsa niqabını olur əğyarə aşina.

Biganələrlə çünki olur aşina, könül,
Kaş olmayaydım ol güli-bixarə aşina.

Guya başında bir güli-alın həvası var,
Bülbül səbəbsiz olmadı gülzarə aşina.

Tökdü, dağıtdı arizə zülfi-siyahını,
Etdi zəmanədə günümü qarə aşina.

Gördüm rəqibə mail olan iltifatını,
Sandım rəqib kim, olacaq yarə aşina.

Cənnət həramım olsun əgər şəkvə eyləsəm,
Öz xahişimlə yaxsa məni narə aşina.

Lakin rəqib pəndin alıb, Seyyida, mənim
Etdi dili-həzinimi sədparə aşina.

* * *

Nə qədər gər ola bu çərxi-cəfacudə bəla,
Olmaz ol qədr ki, var ol büti-bədxudə bəla.

Nə bəlalər gətirir başıma çeşmin, ya rəb,
Nə qədər var imiş ol nərgisi-cadudə bəla.

Xətü xalü səri-zülfündən olub qan könlüm,
Kim görübdür bu qədər ləşkəri-hindudə bəla.

Mərdümi-didələrim rəncədi əşk içrə müdam,
Rəsmdir, kim ki qəriq olsa çəkər sudə bəla.

Ey könül, zülf ilə əbrusuna meyl etmə ki, var
Çini-zülfündə xəta, ol xəmi-əbrudə bəla.

Tapacaqdır məni hər yerdə kim, olsam guya,
Olmasam mən, qalacaqdır qəmü qayqudə bəla.

Görməmək yarı bəla, görməgi qeyr ilə bəla,
Seyyida, düş, yıxıl öl, o da bəla, bu da bəla!

* * *

Vermənəm könlümü bir dilbərə bundan sonra,
Olmanam aşiq o siminbərə bundan sonra.

Aldı iymanımı əldən, məni bidin elədi,
Aşina olmanam ol kafərə bundan sonra.

Oxşayır mahi-fələk çünki üzari-yarə,
Baxmanam mən bu məhi-ənvərə bundan sonra.

Badənin ləli-ləbi-dilbərə çün nisbəti var,
Tökmənəm badəni mən sağərə bundan sonra.

Ənbərin zülfüvün ol qədr ziyanın deyərəm,
Kimsə rəğbət eləməz ənbərə bundan sonra.

Dəxi ol sərvqədin kuyinə cənnət deyibən
Gəzmənəm küçələri heyvərə bundan sonra.

Etmənəm zülfüvün ovsafını, şair deməsin
O pəri Seyyidi-qəmpərvərə bundan sonra.

* * *

Görəsən kim nə imiş hörməti-səhbayə səbəb
Ki, həram etdi bu can cövhərini Şahi-Ərəb.

Məstlikdir səbəbi-hürməti gər səhbanın,
Qeyri-səhba dəxi bu məstligə çoxdu səbəb.

Var ümidim ki, nəsibi ola abi-kövsər,
Rəznişanlıqda ki, dehqan bu qədər çəkdi təəb.

Meyvəsi oxşamasaydı ləbinə dildarın,
Bağban əkməz idi bağdə bir nəxli-rütəb.

Ürəgim qan, sirişkim meyi-gülgunə dönər,
Ləbi-innabinə hərdəm ki, dəgə mai-ənəb.

Udü səndəl nə gərək, nəkhəti-zülfün xoşdur,
Gülrüxüm mən degiləm dəhrdə həmmali-hətəb.

Seyyida, qoymaz idi şaxi-gül üstə qədəmin,
Bülbüli-məstdə olsaydı əgər rəsmi-ədəb.

* * *

Qəmzə peykanın çəkib hərdəm bizə, ey nuşləb,
Bisəbəb qan tökmək istərsən, nədir axır səbəb?

Vaiza, meykəşlərə daim qəzəbdir adətin,
Qorx o gündən kim, sənə piri-müğan eylər qəzəb.

Eşqdə bidərdlər eylər təəccüb halıma,
Yoxsa bu kişvərdə bir dərd əhli yoxdur, büləcəb.

Gözlərin, ey səngdil, sındırdı könlüm şişəsin,
Məstlər bəzmində olmazmış müraati-ədəb.

Dəhr ara bir gül yetirdim, dərdi gülçin aqibət,
Kamə yetdi bitəəb-əğyar, mən çəkdim təəb.

Gahü gər dil istəyir busə üzündən, vəchi var,
Öz fəqirindir ki, quti-layəmut eylər tələb.

Mütriba, ləhni-hicaz ilə sürudun saz qıl,
Ta Məhəmməd eşqinə Seyyid bu şəb etsin tərəb.

* * *

Çıxır can cismdən, bir dəm yetir cananımı, ya rəb!
Görüb rüxsarını təslim edim bu canımı, ya rəb!

Görüb rüxsarını nəzr etmişəm kim, can edim qurban,
Yetir yarı, qəbul eylə mənim qurbanımı, ya rəb!

Təni-zarımdan al ya, ey xuda, bu cani-naşadı,
Mübəddəl qıl visali-yarə ya hicranımı, ya rəb!

Tənuri-pirəzəndən bədtər oldu çəşmi-xunpaşım,
Cahan qərq oldu, sakit eylə bu tufanımı, ya rəb!

Tökəydi qanımı, azad olaydım dərdi-hicrandan,
Gətir bir rəhmə ol bidadgər sultanımı, ya rəb!

Ümidim var kim, görsə fəğanım rəhm edə dilbər,
Yetir ol mahi-bimehrə mənim əfğanımı, ya rəb!

Tutub xət ruyin, oldu fitneyi-dövri-qəmər peyda,
Xətadən hifz qıl bu Seyyidi-nalanımı, ya rəb!

* * *

Oldu sünbüllər xəcil zülfi-pərişanın görüb,
Qönçələr qan oldular ləli-dürəfşanın görüb.

Yusifə zindan təmənna oldu mehrindən sənin,
Aləmi-zərratdə çahi-zənəxdanın görüb.

Bağban hər gündə bir sərvin qopardır bağdən,
Ta kim, ey ruhi-rəvan, sərvi-xuramanın görüb.

Guylər tək əşki-gülgunum olur hər yan rəvan,
Əldə çövkan, ərsədə Rəxş üzrə cövlanın görüb.

Qoy ölüm, axır nəfəsdir, gəlmə nəşim üstə, ta
Qeyrlər mərg etməsin xahiş, bu ehsanın görüb.

Zəxminə mərhəm təsəvvür etdi tiri-Rüstəmi,
Əşkəbus, ey qaşı yay, sinəmdə peykanın görüb.

Qönçə tək yüz pirəhən çak etdi, ey gül, rəşkdən
Seyyidi-xunincigər çaki-giribanın görüb.

* * *

Ol ahu gözlü, deyirlər, bu gün şikarə gedib,
Alıbdı səbrü qərarimi aşikarə, gedib.

Gedib şikarə bu gün ol qəzali-mişkinmu,
Aparmayıb itini bilmirəm nə karə gedib.

Gəlir mənə bu qəmin hər dəqiqəsi bir ay,
Bu gün o mah ki, bu şəhrdən kənarə gedib.

O şəh fərağı mənə rüx veribdi mat oldum,
Vəziri-əql düşüb dərdə, ol səvarə gedib.

Bu gün mənim gözümə afitab tar gəlir,
O zülfi qarə günümü edibdi qarə, gedib.

Gedib o qaşı kaman qeyrilə şikarə bu gün,
Xədəngi-hicri vurub xatirimə yarə, gedib.

Olubdu qaib o mahın behişt rüxsarı,
Salıbdı Seyyidini aşikarə narə, gedib.

* * *

Bu naməni ki, yari-dilaram göndərib,
Canə sürur, könlümə aram göndərib.

Kafurə sehr ilə eləyib müşkdən rəqəm,
Sübh üzrə ya ki, nəqş qılıb şam göndərib.

Bu namə ilə canə verib sərfərazlıq,
Nakamü zar könlümə bir kam göndərib.

Öz aşiqi-şikəstədilü biqərarına,
Ol namə ilə bir neçə peyğam göndərib.

Bilmiş günüm fəraqı ilə qarə olduğun,
Dərdü qəmü fəraqə sərəncam göndərib.

Etmiş visalə Seyyidi-zarın ümidvar,
Öz mübtəlası könlünə aram göndərib.

* * *

Bu gələn kimdi ki, yüz vəlvələ Şirvanə salıb,
Qülğülə, hüsnü onun, aləmi-imkanə salıb.

Qızarıb arizi-ali güli-tər tək meydən,
Açıban ruyini eşq əhlini yüz qanə salıb.

Kimdi bu arizi xurşidi-dirəxşan ki, bu gün
Xunlər ləli-ləbi kuhi-Bədəxşanə salıb.

Bu əzizə neçə Yusiflər olub zarü əsir,
Hansının könlünü ol çahi-zənəxdanə salıb?

Dövri-ruyini tutub ləşkəri-xətti-siyəhi,
Mürlər rəxnə, məgər, mülki-Süleymanə salıb!

Buna Mahmud deyim, bilməyirəm ya ki, Əyaz
Cəzbeyi-eşqini bu xatiri-sultanə salıb.

Görməmiş Seyyidi-sərgəştə o şəmi-hüsnü,
Bu əcəbdir ki, özün atəşi-suzanə salıb.

* * *

Maşallah, bu gözəl kimdi ki, Şirvanə gəlib,
Ləbini mürdeyi-sədsalə görüb canə gəlib.

Həmdlər xaliqi-bimislə ki, Şirvanı genə,
Salmağa tazədən ol müğbəçə samanə gəlib.

Meydə yox ləli-ləbində olan asari-səfa,
Sanma ki, gərdişə hərgiz belə peymanə gəlib.

Vərəqi-arizi-alın görüb ol lalə rüxün,
Bağ ara bülbüli-şeyda genə əfğanə gəlib.

Demərəm adını mən, bax səri-hər beytə bu gün,
Bilisən Seyyid özün kimdi ki, Şirvanə gəlib.

* * *

Ey könül, məscid yolun tərk et, rəhi-meyxanə tut.
Tutma əldə zahidin təsbihini, peymanə tut.

Zahidü məscid təmənnasın çox etmə, ey könül,
Zahidi bir cüğd bil, həm məscidi viranə tut.

Xublər zülfində görsən bu pərişan könlümü,
Boynu bağlanmış onu, zəncirə bir divanə tut.

Ol məhi-namehriban istər ki, zülfün darasın,
Sən götür ayinə ey gün, ey qəmər, sən şanə tut.

Can verib cananə, yan şəmi-rüxündən dilbərin,
Gər kəmal istərsən ey dil, şiveyi-pərvanə tut.

Xublər eşqində gör imdi mənim rüsvalığım,
Qisseyi-Fərhad ilə Məcnunu bir əfsanə tut.

Girmə sən məscidlərə namərd zahidlər kimi,
Seyyida, meyxanədə peymanəni mərdanə tut.

* * *

Könül olubdu fərağında biqərar, ey dust,
Neçin məni elədin zarü dilfikar, ey dust!

Ümid əlim üzülüb daməni-visalından,
Sənə bu növ degildim ümidvar, ey dust!

Binayi-taqətimi seyli-ğəm xərab etdi,
Bu qədr gözlərimi etmə əşkbar, ey dust!

Visaldə neçə gün xoş keçirdi əyyamım,
Həsəd apardı bizə çərxi-kəcmədar, ey dust!

Nə sən fəraqə səbəb olmusan, nə mən bais,
Bu dərdə saldı bizi dövri-ruzigar, ey dust!

Səni vəfalı bilib eşqinə könül verdim,
Pəriliqalərə olmazmış etibar, ey dust!

Olar nə lütf idi, ey gülüzar, bu nə cəfa,
Tərəhhüm et, məni öldürdü xar-xar, ey dust!

Səni qəsəm verirəm ol kərimi-zişənə,
Bəyan qıl mənə könlündə hər nə var, ey dust!

Fəda olum sənə, Seyyid sənin qulamındır,
Bu qədr zillətə etmə onu düçar, ey dust!

* * *

Ey xəstə könül, əzmi-səri-kuyi-nigar et,
Ol kuydə can nəqdini cananə nisar et.

Mahi-rüxi-canan xət ilə oldu siyəhgun,
Gün keçdi, könül, gəl dəxi fikri-şəbi-tar et.

Peymanəni sındırmaya ta səngi-həvadis,
Mey şişələrin dövranə, ey dust, həsar et.

Cəhd et olasan vəsvəseyi-əqldən azad,
Məcnun kimi seyr etməgə səhrayə güzar et.

Məsciddə həsiri eləmə aləti-təzvir,
Mərdanə qədəh tut, bu riyadən dəxi ar et.

Mənzurun əgər aləm ara kəsbi-ziyadır,
Bir mahrüxün tut ətəgin, busi-kənar et.

Ey Seyyid, əgər həşt-behişt isə muradın
Aləmdə, yeri, peyrəviyi-həştü çəhar et.

* * *

Nola dil bilməsə rəmzi-rüxi-cananı dürüst,
Kimdir ol kəs ki, bilə məniyi-Quranı dürüst.

Sünbüli-zülfün o gül etsə şikəstə üzünə,
Qalmaz əhli-vərəin din ilə iymanı dürüst.

Bülbül övsafi-rüxün qıldı məgər gülşəndə,
Qalmadı bağdə bir qönçə giribanı dürüst.

Qönçənin könlü bütün, leyk yox əhdində vəfa,
Bülbülün qəlbi sınıq, etdigi əlhanı dürüst.

Dura bilməz üzüvə mah müqabil bir gün,
Ayda yüz dəfə əgər kim, ola nöqsanı dürüst.

Bir gecə hüsnüvə oxşatdı özün Ay, odu kim,
Elə bir yanı şikəstə olu, bir yanı dürüst.

Demə, Seyyid, ki şikəst eylədi peymanını yar,
Hiç bir yar olurmu ola peymanı dürüst?!

* * *

Yar eyləsə üşşaqi-diləfkarə ədavət,
Mümkün degil aşiq eləsin yarə ədavət.

Gər qanımı içsə mənim ol dilbəri-xunxar,
Mən kafir olum, etsəm o xunxarə ədavət.

Xar etmə məni hicrin ilə, ey güli-bixar,
Gülşəndə hacan gül eləyib xarə ədavət?!

Səlmanınam, ey Əhmədi-Muxtari-zəmanə,
Səlman eləməz Əhmədi-Muxtarə ədavət.

Bir kərrə ədavət eləsəm mən sənə, ey gül,
Yüz kərrə edim Heydəri-Kərrarə ədavət.

Bülbül gülə eylər gilə, ey novgüli-rəna,
Hərgiz eləməz gülşənü gülzarə ədavət.

Yandırdı gecə şəmi-şəbistan pərü balın,
Pərvanə haçan etmiş idi narə ədavət?

Könlümə dolub mehrin, ədavət yeri yoxdur,
Tək sən eləmə Seyyidi-biyarə ədavət.

* * *

Əğyarı ki, gördüm eləyir yarə məhəbbət,
Minbəd gərək mən edim əğyarə məhəbbət.

Gər yar üçün əğyarı tutum dust, nə eybi,
Gül xatirinə eyləmişəm xarə məhəbbət.

Zülfi-siyəhi-yarə şəbih olduğu yüzdən
Daim qılıram rişteyi-zünnarə məhəbbət.

Gər meylim ola şəmi-rüxi-yarə, nə nəqsi,
Adətdi ki, pərvanə edər narə məhəbbət.

Qurbandı dilü can səgi-kuyinə o mahın,
Möminlər edər, rəsmdi, zəvvarə məhəbbət.

Xət gəldi ruxi-yarə, füzun oldu məlalım,
Axır günümü eylədi gör qarə, məhəbbət.

Seyyid, o siyəh zülf mənim oldu tənabım,
Mənsur kimi çəkdi məni darə məhəbbət.

* * *

Müjdə, ey dil, gələcək bu gecə canan xəlvət,
Verəcək qalibi-biruhumuza can xəlvət.

Mərdümi-didə xəyal ilə həmağuş olmuş,
Sanki Bülqeysə edib sərh Süleyman xəlvət.

Sinəmin dağlərin mən necə pinhan qılım,
Olumu, padşəhim, hiç çırağan xəlvət.

Xət gəlibmiş demə rüxsarına ol sim-tənin,
Gətiribmiş, nə bilim, kafəri iyman xəlvət?

Vadiyi-vəhdətə gəl, ey dili-divanə, dəxi
Ola bilməz bu sifət hiç biyaban xəlvət.

Çıxdı pirahəni-çakilə gülüstandan gül,
San, Züleyxa ilə etmiş məhi-Kənan xəlvət.

Gah peyğami-cəfa, gah bəlayi-hicran,
Seyyidə yar qılır gündə bir ehsan xəlvət.

* * *

Nə tutmuşsan, könül, qürbət diyarın, əzmi-Şirvan et,
Tamaşayi-rüxi-yar ilə seyri-kuyi-canan et.

Nə olmuşsan giriftari-qəfəs, ey tayiri-qüdsi,
Çıxıb bu damdən pərvaz qıl, seyri-gülüstan et.

Təəllüq aləmindən əl götür, təcrid qıl hasil,
Məsiha tək məqamın xaneyi-xurşidi-rəxşan et.

Könül ver bir nigarə, fariq ol dünyavü üqbadən,
Pərişanlıq binasın eylə viran, fikri-saman et.

Əgərçi çoxdu Şirvan içrə ziba şuxlər, Seyyid,
Vəli sən canuvi şövq ilə İsmailə qurban et.

* * *

Eylədi vəsf könül arizi-cananı qələt,
Oxudu tifl bu məktəbdə "Gülüstan"ı qələt.

Sandı güldə tapılır nəfxeyi-zülfi-siyəhin,
Etdi hər fəsldə dil seyr bu bustanı qələt.

Səfheyi-arizinə katibi-qüdrət o gülün,
Biməqam etdi rəqəm ol xəti-reyhanı qələt.

Sandılar kim düri-dəndanına həmtay olur,
Saldılar məğlətəyə gövhəri-qəltanı qələt.

Bağdə açdı yüzündən o güli-tazə niqab,
Çaşdırıb bülbül özün, eylədi əlhanı qələt.

Qaşların "nuni-qələm", zülfünü "Vəlleyl" dedim,
Dedilər kim, oxudun ayeyi-quranı qələt.

"Qab-qovseyn" oxudum əbruyi-yarı, Seyyid,
Vay o gündən ki, müfəssir verə mənanı qələt.

* * *

Ta ki, gəldi əbr tək rüxsari-mahi-yarə xət,
Ruzgarım eylədi ol zülflər tək qarə xət.

Atəşin rüxsarə xəttin gəldi könlüm almağa,
Rəsmdir əhli-əzaim kim, salırlar narə xət.

Gülsitani-kuyi-dilbər vəsfinin inşasına,
Katibi-qüdrət yazıb reyhan ilə gülzarə xət.

Gəldi xət rüxsarına, üşşaqə dəgdi yarələr,
Görməmişdim kim, bu sirri qəlbə vursun yarə xət.

Əşki-gülgundur midadım, xameyi-müjgan ilə
Yazdım, ey gül, şami-hicrində dərü divarə xət.

Xətti gəlcək qətli-amə açdı əl ol gül, məgər
Hüsn sultanı yazıbdır qətl üçün sərdarə xət.

Qarə olsun ruzigarı xətti-yarın mən kimi,
Tirə etdi ruzigarım, Seyyida, ol qarə xət.

* * *

Kim ki, ağzın qönçeyi-xəndan güman eylər, qələt,
Ləli-nabın çeşmeyi-heyvan güman eylər, qələt.

Hansı gündən vaqifi-əsrari-qeyb oldu həkim,
Gər dəhanın nöqteyi-pinhan güman eylər, qələt.

Handa görmüş, ya eşitmiş bağbani-ruzigar,
Kakilin gər sünbülü reyhan güman eylər, qələt.

Yusifi bir zərrə hüsnün qıldı məşhuri-cahan,
El səni gər Yusifi-Kənan güman eylər, qələt.

Hər mərəzdə var təbibin şöhrəti, amma əgər
Dərdi-eşqi qabili-dərman güman eylər, qələt.

Talibi-dünya olan dünyadə qalmaz müttəsil,
Aləmi gər mülki-cavidan güman eylər, qələt.

Hiç söz yox şeyxi-şəhrin qüvveyi-təşxisinə,
Seyyidi gər qabili-ürfan güman eylər, qələt.

* * *

Münqəlib oldu həvadislə məni-zarə mizac,
Ey Məsihanəfəsim, qıl məni-bimarə əlac!

Rövşən et xanəmizi bir gecə təşrifinlə,
Ey cəmalı fələki-hüsnə siraci-vəhhac.

Abi-Kövsər ləbi-şirininə nisbət, guya
Biridir əzbi-Fəratü biridir milhi-Ücac.

Tutmusan dəhrdə sən hiç müsəlmanın əlin?
Etməsin tarı sənə kafəri, ya rəb, möhtac!

Şəm pərvanəni yandırmaz idi, amma sən
Yandırıb aşiqi, etdin bunu aləmdə rəvac.

Ləşkəri-Zəngü həbəş tutdular ətrafi-rüxün,
Dəxi müşgüldü bu gün Kəbəyə getsin hüccac.

Daneyi-gəndümi-xalinə təmə eyləmə kim,
Seyyida, cənnəti-kuyindən edərlər ixrac.

* * *

Vəfa rəsmin tutub gəl, ey pəri, cövrü cəfadən keç,
Əgər adəmsən, insaf et, bu vəzi-narəvadən keç.

Gözüm yaşından, ey sərvi-rəvan, rəncidə olmuşsan,
Bu təsiri-sitarəmdir, gəlib ol macəradən keç.

Pərişanlıqdan ol zülfü dedim dün nafeyi-Çindir,
Çevir öz başına, ey gül, məni, sən ol xətadən keç.

Dəhani-yardən bir söz təmənnasindəsən çoxdan,
Nə çıxsın yoxdan, ey dil, bir usan, bu müddəadən keç.

Həsiri aləti-təzvir edib əgləşmə məsciddə,
Gəl, allahı sevərsən, zahida, son bu riyadən keç.

Səfayi-xatir olmaz aşiqə meyxanəsiz, ey dil,
Əgər bu Kəbədən çəkdinsə əl, bəs get Səfadən keç.

Cahan mülkündə, Seyyid, yoxdu bir ehsani-biminnət,
Şikəstə xatirə səbr eyləyib, ol mumiyadən keç.

* * *

Sənsiz fəzayi-cənnəti-məvadə yox fərəh,
Ətrindən olmasa güli-rənadə, yox fərəh.

Eylə mərizi-eşqə ləbin çarə, ey həkim,
Məcuni-ləli-nabi-müsəffadə yox fərəh!

Derlərdi zəfəranı müfərreh, nədəndi bəs,
Rəngim saraldı, yarə bu mənadə yox fərəh!

Busə nə qədr çox ola xoş, laəqəl iki,
Məşhurdur ki, buseyi-tənhadə yox fərəh.

Meydən murad buseyi-sağərdir, ey könül,
Məşrutu olmayan meyi-səhbadə yox fərəh.

Meracın ilə oldu fərəhnak ərşiyan,
Sənsiz, həbibim, ərşi-müəllladə yox fərəh.

Nadan tapar həmişə fərəh vəsli-yardən,
Seyyid, cahanda xatiri-danadə yox fərəh.

* * *

Dedilər xəlq ki, var badeyi-həmradə fərəh,
Yarsız görmədim ol cami-qəməfzadə fərəh.

Yarsız neyləyirəm seyri-gülü gülzarı,
Olmasa yar, olumu cənnəti-məvadə fərəh?

Şəbi-meraci-visalın məni zar etdi rəqib,
Görmədim, seyr elədim çərxi-müəlladə fərəh.

Çeşmi bimarına mərbutdur, ey gül, fərəhim,
Baxmışam yüz kərə, yox nərgisi-şəhladə fərəh.

Dağım olduqca füzun şad olur aşüftə könül,
Tifl üçün eyddə var ziynəti-kaladə fərəh.

Yarımın adını bildikdə fərəh hasil olur,
Onu təshif eləsən var bu müəmmadə fərəh.

Seyyida, eylə fərəh, çəkmə bu dünya qəmini,
Çünki beş günlük olur bülbüli-şeydadə fərəh.

* * *

Ol lalərüxün işvəvü nazı çox imiş, çox,
Üşşaqə onun suzü güdazı çox imiş, çox.

Mehrabi-dü əbrudə könül xeyli zamandır
Qalmış, bilirəm, razü niyazı çox imiş, çox.

Bir Kəbə degilmiş bu Səfa əhlinə qiblə,
Məhbubi-həqin mülki-Hicazı çox imiş, çox.

Müddətdi ki, qıllam qədəmin daşına səcdə,
Eşqin bu məqam içrə nəmazı çox imiş, çox.

Mən az bilirdim mənə ənamını yarın,
Bu cövrü cəfanın, dəxi, azı çox imiş, çox.

Bu səltənəti-eşqdə Məhmud tapılmaz,
Hər guşədə afaqın Əyazı çox imiş, çox.

Yox dəhrdə bir kəs ki, ola arifi-həqbin,
Seyyid, aradım eşqi-məcazi çox imiş, çox.

* * *

Zahida, ol sənəmin zülfi-çəlipasına bax,
Aç bəsirət gözüvü, nərgisi-şəhlasına bax.

Ayeyi-xəmr oxuyur, nəfini inkar qılır,
Tutduğu felini gör, verdigi mənasına bax.

Cənnətə getdi və ya duzəxə mürdə, nə qəmin,
İrsinə dik gözüvü, külçəvü həlvasına bax.

İstəyir cənnəti zahid bu qədər hiylə ilə,
Əbləhin fikrini gör, dildə təmənnasına bax.

Dili-divanə sevən can tək o zülfi-siyəhi,
Başının şurini gör, eşqdə sövdasına bax.

Sanma bu Seyyidi sən əhli-cəhənnəm, vaiz,
Neyləyirsən əməlin, dildə təmənnasına bax.

* * *

Ey zahidi-xudbin, bilirəm kim, hünərin yox.
Meydani-məhəbbət tərəfə bir güzərin yox.

Mehrabdə əgləş ki, cigərdar degilsən,
Bu nari-qəmə yanmağa əsla cigərin yox.

Ta müxbiri-eşq oldu könul, bixəbərəm mən,
Zahid, xəbərim yox, bu xəbərdən xəbərin yox.

Sən eylə pəri, hur xəyalilə ibadət,
Bəzmində ələnnəqd büti-simbərin yox.

Ey zahidi-xüşk, eyləmə üşşaqə təfaxür,
Ahi-səhərin, suzi-dilin, çeşmi-tərin yox.

Nə vəslü nə ağuşü nə bir busü kənarın,
Ey nəxli-məlahət, bizə əsla səmərin yox.

Ey dil, elədin cənnəti-kuyini təmənna,
Uçmağa hanı, heyf, sənin balü pərin yox.

Bəsdir sənə rüxsari-zərü əşk çü simin,
Seyyid, nə qəmin, gərçi sənin simü zərin yox.

* * *

Hər aşiqin ki, sən kimi bir məhcəmalı yox,
Nöqsanı var ki, eşqinin əsla kəmalı yox.

Yüz xətt ilə küsuf edə xurşidi-tələtin,
Mehrin dilimdə zərrə qədər bir zəvalı yox.

Ey bəxtimin sitarəsi, xətt içrə ruyüvi
Gər ay tutuldu dersə görənlər, vəbalı yox.

Yüz vədeyi-visal eləsin ol pəricəmal,
Hərgiz gəlib görünməsinin ehtimalı yox.

Seyyid, qayıt, bu mərhələdən kəs ayağını,
Axır bu rahi-meykədənin bir məalı yox.

***

Yad ol günlər ki, bavər eyləməzdim, ey könül,
Gər şikayət eyləsəydi kimsə hicri-yardən.

***

Eşitdim ta qiyamət qamətindən bir əlamətdir,
Qiyamət həsrətindən hər günüm yüz min qiyamətdir.

***

Ruzi-qətli Seyyidin eylər neçin yar iztirab,
Gər bu məzlumə o şuxi-səngdil qatil degil?

***

Hər zaman derlər ki, qıl bir tazə dilbər arizu,
Padşalıq etmişəm ki, pasibanlıq bilməzəm.

***

Qeyrlər meyl etməgindən yarə bihal olmuşam,
Bəs nolur halım mənim ol meyli-əğyar eyləsə.

***

Əla, ey tiri-dilbər kim, könüldə mihmanımsan,
Əgər can çıxmasaydı cismdən, derdim ki, canımsan.

***

Fariqimdən degiləm şad, vəli əğyarın
Bağrı qan olmaq üçün gül təki xəndan oluram.

***

Ölmə eşəgim, sabah olur yaz,
Yonca bitibən işin olur saz.

***

Bir yaxşı üçün yaman sevərlər,
Gül xatirinə tikan sevərlər.

***

Ləbbəstədir əhli-hal ağzı,
El ağzı, demək, çuval ağzı.

***

Yağmurdən eyləyən fərarı,
Axır doluya düşər güzarı.

***

Yat rahətilə, tut öz sayağın,
Yorqanuva düz uzat ayağın.

***

Rəqibim rəşk edər kim, Seyyidə dilbər cəfa qılmaz,
Haçan mən xatiri-dildarə düşdum kim, cəfa qılsın?

***

Təəccübdür ki, Məcnun qaldı zində Hicri-Leyladə,
Məgər ol vəqt hicranın yox imiş beylə təsiri?

***

Yüz mama olsa, ey güruhi-bəşər,
Bu məsəldir ki, güc doğanə düşər.

***

Bəli, hər bir kəsin var bir səyağı,
Böyük başın böyükdür ağrımağı.

***

Ey əzizim, hesab yox yaşda,
Bu müşəxxəsdi əql olur başda.

***

Sazı səksəndə ögrənən idbar,
Bir də anı qiyamət olsa çalar.

***

Can kuyi-nigarə oldu azim,
Şəhri görənə bələd nə lazim.

# Qitələr

İntiqam ilə könül gərçi olur şad, vəli
Dəmi-qüdrətdə füzundur fərəhü zövqü səfa.
Hər cəfa eyliyənə qəsdi-mükafat etsən,
Bəs gərək ömrü giranmayə ola sərfi-cəfa.

***

Dedilər dün o şəkərləb mənə düşnam verib,
Məndə ol bəxtü səadət hanı, böhtandır bu.
Sipəhi-xətt gəlir arizüvə fövcbəfövc,
Rum mülkündə olan leşkəri-sultandır bu.
Seyyida, yox dedi dərman qəmi-hicranə təbib,
Çox qələt eylədi ol, gör necə dərmandır bu?!

***

Könül tapmazdı yol ləli-ləbindən kamə yetməkçün,
Bihəmdilləh ki, gəldi səbz xəttin Xızri-rah oldu.
O zalım bir günah axtardı ki, Seyyid, tökə qanım,
Günahım olmamaq axırda qətlimçün günah oldu.

***

Var neçə şair ki, rəsmi-şeri məndən ögrənib,
Onların ustadiyəm, aləm bilir, bilittifaq.
Mən atalıq etmişəm, onlar mənə övladdır,
Bəzi onlardan olurlar indi gər ustadə ağ,
İddia eylər ki, şairlikdə səndən mahirəm,
Banəmək əşarıma aləm çəkirlər iştiyaq.
Mən də inkar etmirəm, əmma ki, vardır bir məsəl:
“Şux qoduq şıllaq atar, düşmüş anasından qabaq”.

***

Rəsmü rəhi-əşarı, təlim tapıb məndən,
İndi özünü Bixud ustad sanır əmda.
Bir ayda tamam olmaz tək bir qəzəli hərgiz,

Bir fərdi bu gün yazsa, bir fərdi yazar fərda.
Əfsus o gündən kim, it sahibinə hürsün,
İt olsa quduz yoxdur dərmanı onun, dərda!
Ey Bixudi-kəmhimmət, bu misrəi vird eylə:
“Mən əlləməni hərfən, qəd səyyərəni əbda”*.

***

Bixudi-zahirpərəst zahirimə bənd olub,
Çıxmadı başı onun, heyf içimdən mənim;
Adımı qoymuş çoban, gərçi şəbanəm, vəli,
Tifli-ibarət əmər şir keçimdən mənim.
Laş verib bəslədim hər küçüyü dəhrdə,
Ta ki, gəlib oldu it, tutdu qıçımdan mənim.

***

Biz iki şairik, fələk, axır
Bizi hər xasiyətdə tovəm qıl.
Ya məni eşşək eylə Bixud tək,
Ya onu mən kimi bir adəm qıl.

***

Saqi, hanı xurşid-mey axır ki, sabah
Bisağəri-mey əhli-vəfa xuncigər oldu.
Verdim könül ümmid ilə bir özgə nigarə,
Bədbəxtligim gör ki, bu ondan bətər oldu.
Mən dərdi-dilim ərz qılırdım, dedi ol şux:
– Hay, hay, bu da gəldi bizə bir dərdi-sər oldu.
Əğyar nə bilsin ki, nədir surəti-halım,
Xud mən bilirəm ki, mənə axır nələr oldu.

***

Qardə gər acından olsa həlak,
Yeməz it artığın zəmanədə şir.
Lacivərdi tiladı divarə,
Gər müxənnəs geyə libasi-hərir.

---

* Tərcüməsi: Kim mənə bir söz öyrətsə, mən ona qul olaram.

Gər Firidunə çatsa dövlətdə,
Bihünər kimsədir cihanda fəqir.
Yemə namərd löqməsin Seyyid,
Sifəti etməsin sənə təsir.
Şahidi-razdən götür bürqə,
Qoy səni xəlq eyləsin təkfir.

***

Visali-yari-gülrüxsar axır döndü hicranə,
Məqamım rovzeyi-rizvan ikən axırda nar oldu.
Məgər əbri-bahari mən kimi bir güldən ayrılmış
Ki, rəngi tirə olduvü çeşmi əşkbar oldu.
Fəraqi-yari-gülrüxsardən incinmə, ey Seyyid,
Kimin-yarı yanında qaldı, kimlər kamkar oldu.

***

Fövti-şəhi-hüsn üçün tutmuş ikən xət əza
Həftədə bir yol o məh leyk qəradən çıxar.
Bilsə ləbi-ləlinin sirrini faş etdigim,
Könlü dəxi qönçə tək badi-səbadən çıxar.

# Tərkibbəndlər

Ey xoş ol günlər ki, bəzmimdə nigarım var idi,
Zövqi-didarilə könlümdə qərarım var idi,
Bir üzarı mah, zülfü müşkbarım var idi,
Ləbləri şəkkər, üzü gül tacdarım var idi,
Bir cəmalı rəşki-bağü gülüzarım var idi,
Sünbülüm, sərvim, gülüm, bağım, baharım var idi,
Bir pəri peykər, mələk rüxsar yarım var idi,
Kim hərimi-vəslinə busü kənarım var idi,
Yar vəslindən, qərəz, xoş ruzgarım var idi,
Eyləməzdim meyli-gül, ol gülüzarım var idi.

Rəşk edib dövri-zəmanə saldı firqət, aqibət,
Qoydu ol mahə məni-nalani həsrət, aqibət.

Ey düri-yekta ki, yoxdur aləm içrə qiymətin,
Dilrübalıqda tutub cümlə cahanı şöhrətin,
Gərçi mən çəkdim rəhi-eşqində rəncü zəhmətin,
Verdi hər gün yüz mənə yüz min bəlavü möhnətin,
Oldu, ey gül, həm sənin hər xarə meylü ülfətin,
Özgələr bəzmin münəvvər qıldı mahi-tələtin,
Əlqərəz kim, oldu qismət qeyrə xani-vəslətin,
Qaldı mən dilxəstəyə ancaq məlalü xiffətin,
Ah, yüz min ah, əgər könlümdə qalsa həsrətin,
Qət edər sərrişteyi-ömrümü tiği-firqətin.

Billah örtülməz məzarım ahü zarımdan mənim,
Baş çəkər topraqdən əflakə suzü şivənim.

Bəs ki, hər şəb firqətindən eylərəm çox ahü zar,
Halıma ağlar dərü divar, yeksər biqərar,
Zəf olub qalib, məni dün xab alıb biixtiyar,

Xab tutcaq çeşmimi, gördüm səni, ey gülüzar,
Eylə bildim ki, degildir xab, sandım aşkar,
Yalvarıb öpdüm əlin, düşdüm ayağə xaksar,
Eylədim hicran əlindən çox şikayət bişümar,
Kim, visalından məni dur etdi devri-ruzigar,
Eylər idin Seyyidi həm vəslinə ümmidvar,
Nagəh oldum xabdən bidar, gördüm yoxdu yar.

Qüssədən ta sübh olunca zarü bidar ağladım,
Oldu cari gözlərimdən əşki-gülnar, ağladım.

## İNSANIN XİLQƏTİ, HƏQİQİ VƏ MƏCAZİ EŞQ HAQQINDA*

Ümməhatə oluban səbeyi-rəxşan şövhər,
Çəkdilər rənclər iycadım üçün həft pədər.
Həft aba mənə izhar elədi tərbiyətin,
Etdi tövlid məni ta ki, bu əsfəl madər.
Dörd ana yeddi atadan üç oğul oldu əyan,
Oldu bu üç oğulun əfzəli ənvai-bəşər,
Əql istərdi mənə tərbiyət etsin, nagəh
Eşq peyda oluban qıldı məni zirü zəbər.
Saldı sövdayə məni rişteyi-kakil həvəsi,
Qıldı aşüftəvü dərhəm məni zülfi-dilbər.
İstər idim günü-gündən ola canım niku,
Elədi eşq mənim canımı bəddən bədtər.

Müxtəsər, aşiq olan olmaz imiş dəhrdə şad,
Bir zaman olmaz imiş dərdü bəladən azad.

Ey xoş ol dəm ki, mənim eşq ilə karım yox idi,
Bimi-əğyar, könüldə qəmi-yarım yox idi.
Gəlməmişdim hələ mən kətmi-ədəmdən birun,
Vadiyi-eşqi-bəlaxizə güzarım yox idi.
Eşqü aşiqlik işin bilməz idim aləm ara,
Dili-bidərddə ənduhü qübarım yox idi.
Xar-xarım yox idi bu güli-rənalər üçün,
Fikri-novruz, qəmi-fəsli-baharım yox idi.
Nəzərimdə yox idi cilveyi-hüsni-məhbub,
Zərrəcə ayineyi-dildə qübarım yox idi.
Qəflət etmişdi məni dami-bəladən fariğ –
Ki, hərimi-hərəmi-qeyddə barım yox idi.

---

* Bu tərkibbənd Füzulinin:
Ey xoş an dəm ki be hər niku bədəş kar nə bud,
Bim əz təneyi-əğyarü ğəmi-yar nə bud.
mətləli tərkibbəndinin tərcüməsidir.

Rəşk asayişimə çərxi-cəfakar etdi,
Dərd üçün ta ki, ədəmdən məni izhar etdi.

Cani-aşüftə əsir oldu dili-şeydayə,
Səri-sərgəştə giriftar qəmi-dünyayə,
Daneyi-xalı görüb mürği-könül bənd oldu,
Dami-giysuyi-büti-lalərüxi-zibayə.
Oldu atəşgədeyi-qüssə dili-suzanım,
Saldı kakil həvəsi başımı bir sövdayə.
Şahidi-fitrəti-əsliyyəm açıb pərdəsini
Rüxi-zibasını göstərdi məni-rüsvayə.
Dilü canü tənə yalvardım, olar etmədi guş,
Bir zaman etmədilər rəhm məni-şeydayə.
Dilü canü tən olub maili-dünyayi-dəni.
Saldılar aqibət aləmdə məni qovğayə.

Gördülər acizəm, onlar məni bəs xar etdi,
Hər üçü silsileyi-zəbtə giriftar etdi.

İqtidayi-tənü canü dili-şeyda etdim.
Özümü aşiq olub maili-dünya etdim.
Dilü canü tənimə vermək üçün rahətlər,
Rənclər çəkdimü əsbab mühəyya etdim.
Mülki-aləmdə pərişanlığa əsbab oldu
Mən ki, cəmiyyət üçün hər nə təmənna etdim.
Aləmi-qüdsdə bir aqilü fərzanə ikən,
Özümü aləmi-nasutdə rüsva etdim.
Rahət idim, rəhi-təşvişü bəlanı tutdum,
Əcəb asudə idim dəğdəğə peyda etdim.
Hiç sövdə girəhi açmadı əhvalımdan,
Aciz oldum dəxi tərki-hamı sövda etdim.

Eşq peyda oluban tutdu mənim damənimi,
Yaxdı qeyrət oduna bu dilü canü tənimi.

Bir gülün eşqinə ta etdi giriftar məni,
Saldı nagəh oda yandırdı əcəb nar məni.
Gah göstərdi qədin, göglərə çıxdı ahım,

Gah göstərdi gözün, eylədi bimar məni.
Gecələr həsrəti-mahi-rüxi-zibası ilə,
Dərd ilə sübhə kimi eylədi bidar məni.
Gəh giriftar elədi könlümü tari-kakil,
Gəh əsir eylədi ol türreyi-tərrar məni.
Qətrə-qətrə cigərim qanı gözümdən gəlibən,
Etdi rüsvayi-cahan dideyi-xunbar məni.
Ah, ol simtənü sərvqədü laləüzar,
Eylədi baği-məhəbbətdə belə xar məni.

Ah kim, xatiri dilşad olur azarımdan,
Bir xəbər tutmadı əhvali-dili-zarımdam.

Ta giriftar degildim bu ədası yox idi.
Dəmbədəm aşiqi-miskinə cəfası yox idi.
Nərgisi-məsti mənə eylər idi mərdümlük,
O qara gözlərinin bunca bəlası yox idi.
Yad eylərdi məni, halımı eylərdi sual,
Bu cəfası, bu ədası, bu həvası yox idi.
Almamışdı rəvişi-cövrü cəfanı təlim,
Cövr üçün xatirinin hiç rizası yox idi.
Xütən ahusu kimi çeşmi olurdu mənə ram,
Çini-giysulərinin səhvü xətası yox idi.
Kəbeyi-kuyi mənim olmuş idi səcdəgəhim,
Yarsız məclisimin zövqü səfası yox idi.

Lütfünün eyni-sitəm olduğunu bilməz idim,
Qəsdinin möhnətü qəm olduğunu bilməz idim.

Ta ki seyd etdi məni, ruyini pinhan elədi,
Bağrımı qönçə kimi möhnət ilə qan elədi.
Məndən ülfət kəsibən baxdı rəqibin sözünə,
Tiği-bidad çəkib qəsdi-dilü can elədi.
Bir nigah ilə mən oldum gözünün bimarı,
Məni dərd ilə qoyub özgəyə dərman elədi.
Nə deyim mən ki, nələr qıldı mənə hicranı,
Demək olmaz o cəfa kim, mənə hicran elədi.

Könül ümmidi-vəfa ilə əsir olmuş idi,
Cövr ilə xaneyi-ümmidimi viran elədi.
Nə fəraqinə olur səbr, nə vəsli məqdur,
Neyləyim, çarə nədir kim, məni heyran elədi.

Dün gecə təngə gəlib yar ilə göftar etdim,
Ta ki fürsət tapıban dərdi-dil izhar etdim.

Dedim, ey canü könül xəsteyi-azari-qəmin,
Xəm qılıb qamətimi bari-bəlavü sitəmin.
Yoxdu bir dəm ki, sitəm görməyə səndən könlüm,
Çəkirəm aləm ara mən sitəmi-dəmbədəmin.
Netmişəm* mən sənə, ey şah, müqəssirlər tək,
Bağlayıb gərdənimi türreyi-pürpiçü xəmin.
Nəzəri-mərhəmətin var idi əzzəldə mənə,
Sürmə idi gözümə şövq ilə xaki-qədəmin.
Nə günah etmişəm, ey sərvi-riyazi-cənnət –
Ki, başımdan gedib ol sayeyi-lütfü kərəmin.
Bundan artıq mənə sən etmə dəxi cövrü cəfa,
Qalmayıb dildə dəxi taqəti-bari-ələmin.

Dedi: sən talibi-iksirsən, ey bisərü pa,
Kim görübdür, görəsən sən də pərilərdə vəfa.

Hər kimi biz ki, məhəbbətdə giriftar edərik,
Bağlarıq zülfə, günün möhnət ilə tar edərik.
Nərgisi-məstimizə kimsə ki, olsa aşiq,
Vermərik şərbəti-vəsli, onu bimar edərik.
Güli-rüxsarımıza kimsə ki, olsa talib,
Açmarıq üz ona, əlbəttə onu xar edərik.
Görməz aləmdə bizim pərtövi-rüxsarımızı,
Biz üzü şəmi-şəbi-məclisi-əğyar edərik.
Allıq əldən bizə aşiq olanın iymanın,
Bağlayıb zülfümüzü boynuna zünnar edərik.
Alarıq könlünü baziçeyi-eşq ilə onun,
Tutuban istəsə bizdən onu, inkar edərik.

---

* Nə etmişəm

Müxtəsər, aşiq olan dəhrdə yetməz kamə,
Bəs gərək səbr eləyə dərdü qəmi-əyyamə.

Dedim: ey ruhi-rəvan, eyləmə bunca məni zar,
Xoş degildir bu qədər kim, edəsən cövr şüar.
Gözümün mərdümünü eyləmə xunabəyə qərq,
Nə rəvadır olasan mərdümi-mərdümazar.
Nəxli-cövr əkmə ki, verməz səməri-xub sənə,
Rəhm qıl ta ki, cahanda olasan bərxurdar.
Düri-guş eyləmə əğyari-müxalif sözünü,
Eyləmə ülfəti-yarani-müvafiqdən ar.
Bu qədər, mahrüxüm, hüsnüvə olma qürrə,
Tez yetər hüsnüvə aləmdə zəvali-şəbi-tar.
Xət gəlib ayineyi-hüsnüvü eylər tirə,
Surətin məhv olu, qalmaz bu səfadən asar.

Tapar afaqdə təğyir güli-rüxsarın,
Atəşin dud qılar, sərd olur bazarın.

Həvəsi-türreyi-tərrarüvi etməz bir kəs,
Meyli-nəzzareyi-rüxsarüvi etməz bir kəs.
Kami-üşşaqə ləbindən tökəsən şəkkər əgər,
Həvəsi-ləli-şəkərbarüvi etməz bir kəs.
Qapuvi səcdəgəh etməz dəxi ərbabi-nəzər,
Tövf, Kəbə kimi divarüvi etməz bir kəs.
Kəbk tək naz ilə hərçənd xüram eyləyəsən,
Arizu şiveyi-rəftarüvi etməz bir kəs.
Hər kəsin yanına getsən, çəki* səndən üzünü –
Ki, tələb nərgisi-bimarüvi etməz bir kəs.
Bir kəsi görməsən aşüftə, pərişanxatir,
Arizü zülfi-siyəhtarüvi etməz bir kəs.

O sifət olma o gündə ki, xəcalət çəkəsən,
Eşidib tənələri bari-məlalət çəkəsən.

---

* Çəkir, çəkər

Etmədi pəndlərim ol büti-səngindilə kar,
Qılmadı rəhm mənə, eylədi azarı şüar.
Etmədi tərki-cəfa, gözləmədi rahi-vəfa,
Eylədi bu dili pürxunuma hərdəm azar.
Heyrəti-zülfü rüxilə o büti-kafərkiş
Ağladıb dideyi-pürxunumu hər leylü nəhar.
Cigərim daş degildi o büti-kafər tək,
Etmədim tab cəfayə, səfər etdim naçar.
Rənc ilə bir neçə il möhnəti-qürbət çəkdim,
Könlümü qan elədi həsrəti-didari-nigar.
Etdi hər xarə özün ol güli-rəna həmdəm,
Qıldı hər xarı sərəfraz, məni eylədi xar.

Yadə düşdükcə o gül eylər idim əfqanı,
Gözlərimdən tökülürdü cigərimin qanı.

Mülki-qürbətdə mənə olmadı bir rah güşad,
Bəlkə yadilə qəmi-eşq dəxi oldu ziyad,
Ağlayırdım, aparırdı məni seyli-möhnət,
Ah edərdim dağıda xirməni-aramımı bad.
Gərçi çıxmazdı o gülçöhrə mənim yadımdan,
Gördüm ol səngdil etməz məni peyğam ilə yad.
Genə bisəbrlik aramımı aldı əldən,
Arizuyi-vətəni eylədi qəlbi-naşad.
Bağladım rəxti-səfər ta ki, yetişdim vətənə,
Görüb əhbabları, qüssədən oldum azad.
Çün yetişdim vətənə əzmi-təmaşa qıldım
O güli-alə ki, etmişdi mənə çox bidad.

Gördüm ol səbzeyi-biganə gülüstanı tutub,
Xətti-reyhanı gəlib səfheyi-quranı tutub.

Səbzələr pərdeyi-hüsni-güli-rüxsarı olub,
Xarlər rahzəni-səfheyi-gülzarı olub,
Tərk edib talib olanlar Ərəfati-kuyin,
Dəxi mətruk o gülün Kəbeyi-didarı olub.
Tərk edib aşiq olanlar həvəsi-didarın,

Özü aşiqlərin, ol şux, tələbkarı olub.
Müntəzirlər hamı ondan eləyib qəti-nəzər,
Mötəqidlər hamısı münkiri-ətvarı olub.
Dəxi sərməst degil badeyi-qəflətdən o gül,
Ayılıb, huşə gəlib, dərd xəbərdarı olub.
Bir gəda tək ki, özün xabdə sultan görmüş,
Göz açıb vaqiənin, heyf ki, bidarı olub.

Atəşi-həsrət onun könlünə çəkmiş yüz dağ,
Dağılıb rövnəqi-cəmiyyəti, aşüftə dimağ.

Suzişi-daği-dilim oldu çü ol xətdən kəm,
Bitəkəllüf xəti daği-dilə oldu mərhəm.
Əndək-əndək azalıb sinədə suzi-eşqim,
Rəftə-rəftə dili-qəmpərvərim oldu xürrəm.
Gərçi ol şiftəhal oldu pərişanxatir,
Leyk canım olub asudə, dil oldu biğəm.
Dil ki, məhrum idi eyşü tərəbi-aləmdən,
Ta hərimi-hərəmi-işrətə oldu məhrəm.
Canü tən olmuş idi zövqi-cahandan qafil,
Tazədən oldula məşğuli-səfayi-aləm.
Ələmi-işrətini könlüm ucaltdı fələkə,
Yetdi əflakə başım, rəf olub dərdü ələm.

Çünki biğəm özümü, ol gülü qəmgin gördüm,
Etmədim səbr, gedib yanına halın sordum.

Dedim: ol səndə olan şiveyi-rəftar hanı,
Ləbi-şirin hanı, ol ləzzəti-göftar hanı?
Salikani-rəhi-sövdaların aya nə olub,
Eşqbazani-diləfkarü giriftar hanı?
Bənddə yoxdu əsirani-diləfkarlərin,
Paybəndani-səri-türreyi-tərrar hanı?
Ləblərindən niyə sərməst degil zövq əhli,
Meyi-keyfiyyəti-ol ləli-şəkərbar hanı?

Dedi: Seyyid, nə vurarsan mənə hərdəm tənə,
De görüm, səndə olan dideyi-xunbar hanı?
Naxüni-qəmlə nədən eyləməsən sinə xəraş,
Dili-sövdazədəvü sineyi-əfkar hanı?

Surəti-faniyə sən könlünü vermə, zinhar,
Gər bəqa talibisən məniyə ol bərxurdar.

Etdi ol gül məni bu badeyi-göftar ilə məst,
Sındırıb bütlərimi çəkdim əlayiqdən dəst.
Kəbeyi-könlümü etdim dəxi bütlərdən pak,
Yədi-qüdrətlə edib Lat ilə Üzzanı şikəst.
Keçibən eşqi-məcazini həqiqət tapdım,
Üzülüb zindeyi-cavid ilə oldu peyvəst.
Var ümidim ki, məni salmaz ayaqə gərdun,
Verdi məşuqi-əzəl çünki mənim dəstimə dəst.
Can məşaminə gəlib eşqi-həqiqət buyi,
Ta dilü canım olub talibi-peymani-ələst.
Dilə nəqş eylədim ol xaliqi-davər eşqin –
Ki, məni dəhrdə nabud ikən, ol eylədi həst.

Üzvi-üzvümdən olur aləmə sadir bu səda:
"La şərikə ləhü fil-mülki və rəbbi əhəda"*.

---

* Tərcüməsi: Kainatda onun şəriki yoxdur, mənim Allahım təkdir.

# Müxəmməslər

Qəm eyləmərəm çərx ala simu zəri məndən,
Tək eyləməsin dur meyi-əhməri məndən,
Can cövhəridir, almayın ol cövhəri məndən,
Ey saqi, diriğ etməgilən sağəri məndən,
Bir cam ilə rəf eylə bu dərdi-səri məndən.

Zahid, tutalım həşr günü duzəxiyəm mən,
Hardan gəlibən sən, görək, oldun belə eymən,
Sən qullar ilə rəbbin ədasın nə bilirsən,
Bakim nə mənim duzəxin atəşgədəsindən,
Almazsa əgər lücceyi-çeşmi-təri məndən.

Kimdir o ki, hiç olmaya aləmdə günahi,
Var bu qapının mən kimi çox ruy-siyahi,
Hərçənd ki, çox eyləmişəm feli-mənahi,
Mən anladığım əfv isə, əfv eylər ilahi,
Sorma günəhim qeyrdən, al dəftəri məndən.

Yüz hiylə ilə məkr edib əğyari-cəfakar,
Məndən o gülü eylədilər axırı bizar,
İndi kimə dərdim deyim, aləmdə kimim var?
Olsun görəyim, möhnəti-hicranə giriftar
Rəncidə edən ol büti-məhpeykəri məndən.

* * *

Müənbər kakilin kim rişteyi-can ilə tövəmdir,
Həbibim, hər teli can boynuna bir qeydi-mökhəmdir,
Məni rüsvayi-aləm eyləyən ol zülfi-pürxəmdir,
Verib taracə eşqin əqlimi, məşhuri-aləmdir,
Dili-zarım əsiri-dərdi-eşqü möhnətü qəmdir.

Məni şad eyləməz, ey gül, baharü bustan sənsiz,
Həram olsun mənə, ey dilrüba, eyşi-cahan sənsiz,
Məhü xurşidə baxsam bir dəm olmam şadman sənsiz,
Cəhənnəm məskənim olsun, behiştə gər rəvan sənsiz,
Dönər hicrinlə könlüm qanə guya kim, cəhənnəmdir.

Məhi-gərdun deyil mehri-üzarın kimi rəxşəndə,
Həqiqət, arizindəndir məhü xurşid şərməndə,
Müəvvər arizində ol ərəqdirmi nümayəndə
Və ya olmuş məh üzrə xuşeyi-Pərvin pərakəndə,
Düşüb bərgi-gül üzrə yoxsa öylə iqdi-şəbnəmdir?

Müsəlsəl sünbülün kim, candadır yüz piçü tab ondan,
Hifazi-mahidir kim, münkəsifdir afitab ondan,
Məgər azərdi hicranın, olur aşiq kəbab ondan,
Visalın kimyadır kim, dil olmaz kamiyab ondan,
Dəhanın qönçeyi-sirab, iəlin sirri-mübhəmdir.

Mükəddərxatir olma çox da qəmdən, binəva Seyyid,
Hərimi-vəsldən məhrum olan, ey mübtəla Seyyid,
Mürüvvət qıl, nigarım, bunca çəksinmi bəla Seyyid,
Verib yəğmayə əqlü huşunu bəxti qəra Seyyid,
Dönüb Məcnunə eşqindən, cigərxun, didə pürnəmdir.

* * *

Bihəmdilləh, yolunda aqibət xak oldu can, tən həm.
Qutardın şivənimdən sən, bəlayi-hicrdən mən həm,
Tükəndi dərdi-eşqin, məndən oldu qət şivən həm,
Həm oldum mən məlalü qüssədən asudədil, sən həm.

Xəyali-nərgisi-didar ilə bimardır könlüm,
Düşübdür atəşi-eşqə sərapa nardır könlüm,
Qədü rüxsarın hicranilə gərçi zardır könlüm
Ki, şad etməz onu nəzzareyi-şimşadü gülşən həm.

Gülüstani-cəmalından düşübdür ta cüda könlüm,
Çəkər hər ləhzə bülbül tək nəva, bu binəva könlüm,
Durubdur öylə çün künci-qəfəsdə mübtəla könlüm
Ki, etməz arizuyi-aşiyanü meyli-gülşən həm.

Qılıbdır rüzgarım qarə zülfi-ənbərəfşanın,
Edibdir könlümü məcruh zəxmi-tiri-müjganın,
Salıbdır Seyyidi bir halə kim, əyyami-hicranın,
Görüb əhvalın, ey birəhm, ağlar dustü düşmən həm.

## FÜZULİNİ TƏXMİS

Qədəhlərdə hübab-asa könül düşmüş həvalərdən,
Şərabi-nabsız dil Kəbəsi düşdü səfalərdən,
Qutarmaz, olmayınca məst, eşq əhli bəlalərdən,
“Kərəm qıl, kəsmə saqi, iltifatın binəvalərdən,
Əlindən gəldigi xeyri diriğ etmə gədalardən”.

Dəri-dilbərdə hasildirmi əhli-eşqin amali
Və ya dəsti-fələkdən mən tək olmuş qüssə pamali,
Məni, hal əhlisən, bir hal ilə qıl haldən hali,
“Səba, kuyində dildarın nədir üftadələr halı,
Bizim yerdən gəlirsən, bir xəbər ver aşinalərdən”.

Şikəstə kaseyi-çini misali, bir sədamız yox,
Sınıq ney tək həvadən düşmüşük, bir dəm nəvamız yox,
Səba, ol gül bədəndən nameyi-rahətfəzamız yox,
“Əsiri-qürbətiz, bir səndən özgə aşinamız yox,
Ayağın kəsmə, başınçün, bizim möhnətsəralərdən”.

Tənuri-çeşmimə gərdun qılıb tufan təlqini,
Sirişki-çeşmi-xunbarımdan almış səbrü təmkini,
O sərvin təlx badaminə verdim cani-şirini,
“Təbiba, xaki-kuyi-yardəndir əşk təskini,
Mənə artırma zəhmət, göz yaşarar tutiyalərdən”.

Qəsəm piri-müğanə, parisalər peyrəvi olmam,
Bu qovmi-xudfüruşü xudnümalər peyrəvi olmam,
Həqiqət əhliyəm, əhli-riyalər peyrəvi olmam,
“Girib məscidlərə gər müqtədalər peyrəvi olmam,
Budur vəchi ki, hərgiz görmədim üz müqtədalərdən”.

Müqimi-Kəbə Sənanın görəydi yari-tərsasın,
Salardı boynuna zənciri-giysuyi-çəlipasın,
Köz aç, ey bibəsər, hər yerdə gör həqqin təcəllasın,
“Demə zahid ki, tərk et simbər bütlər təmaşasın.
Məni kim qurtarar tanrı sataşdırmış bəlalərdən”.

Visali-xirmənindən etmədim bir xuşə də hasil,
Visalə yetməgim düşvar, hicrə dözməgim müşkil,
Nə öldüm qurtarım kim, mən nə oldum vəslinə vasil,
“Fələkdir mehri zail, yar qafil, ömr müstəcil,
Nədir tədbir bilməm, canə yetdim bivəfalərdən”.

Qoyub hüsnün təmaşasını hərgiz meyli-mah etmən,
Bu yüzdən nameyi-əmalımı hərgiz siyah etmən,
Nə gündür kim, qübari-asitanən səcdəgah etmən,
“Vücudum ney kimi surax-surax olsa ah etmən,
Məhəbbətdən dəm urdum, incimək olmaz cəfalərdən”.

Deməm ki, lütfüvü çox, ya ki, cövrü zülmü az eylə,
Açıb zülfi-siyahın Seyyidin ömrün diraz eylə,
Həqiqət xahiş etsən, məşqini eşqi-məcaz eylə,
“Füzuli, nazəninlər görsən izhari-niyaz eylə,
Tərəhhüm umsa eyb olmaz gədalər padşalərdən”.

* * *

Məgər bənəfşə müəttər qılıb gülüstani,
Nəsim cünbüşü təprətdi şaxi-reyhani,
Şəmimi-müşk tutub səfheyi-biyabani,
Və ya dağıtdı səba tari-zülfi-canani –
Ki, tutdu ətri sərasər təmam dünyanı.

Səhabdən yüzünü afitab edib izhar,
Təcəlli eylədi ya şaxi-Turdən ənvar
Və ya cahanə gəlib huriyani-gülrüxsar
Və ya ki zülf arasından göründü çöhreyi-yar,
Firuği-tələti etdi cahanı nurani.

Göründü aləmə yoxsa əlaməti-məhşər
Və ya qiyaməti-üzmadən oldu yoxsa xəbər,
Bəlayi-nagəh edibdir nüzul xəlqə məgər
Və ya xuramə gəlib sərvi-qaməti-dilbər –
Ki, iztirabə düşüb xəlq olubdur heyrani.

Məgər müsəxxər olub əhli-küfrə qibleyi-din,
Olubdu küfrə mübəddəl büsati-ruyi-zəmin
Və ya sipahi-xəvaric olubla Kəbənişin
Və ya ki qəmzeyi-dilbər çəkibdi xəncəri-kin –
Ki, getdi xəlqin əlindən əsasi-iymani.

Cahanda abi-bəqadən məgər göründü nişan
Və ya dübarə Məsih ibn-Məryəm oldu əyan,
Yetişdi hökmi-bəqa, yoxsa hökmi-biimkan
Və ya açıldı təkəllüm ilə ləbi-canan,
Yetirdi firqeyi-əmvatə müjdeyi-cani.

Olubdu mülki-cahan qistü ədldən məmur,
Dönübdü sahəti-xüldi-bərinə vadiyi-Tur,
Yaxıbdı çoxları Musa kimi təcəlliyi-nur,
Məgər ki, hüccəti-əsr eyləyibdi əsrə zühur,
Cahanə şamil olub feyzi-zati-rəbbani.

Amandı çək əlüvi, Seyyida, müəmmadən,
Cahanı şübhəyə salma işarə, iymadən,
Götür niqab rüxi-şahidi-dilaradən,
Göründü nuri-bəha kuhi-Turi-Sinadən,
Cahanə etdi təcəlla cəmali-sübhani.

* * *

Bəlayi-eşqə düşdün, ey büti-məhparə, səbr eylə,
Günün oldisə gər hicran əlindən qarə, səbr eylə,
Ümidi-vəsli-cənnət eyləyib yan narə, səbr eylə,
Düşüb Məcnun kimi səhranı gəz avarə, səbr eylə,
Cəfayi-dövri-gərdun dunü kəcrəftarə, səbr eylə.

Bu ahugözlülər bağlar kəməndi-zülf ilə şiri,
Tökübdür çoxların qanın bu yolda eşq şəmşiri,
İtirmə kəsrəti-qəmdən, əzizim, rahi-tədbiri,
Məhəbbət pak olursa, çox olur əlbəttə təsiri,
Edər ahın əsər ol dilbəri-xunxarə, səbr eylə.

Oxurdum məktəbi-üşşaqdə təsnifi-Loğmanı –
Ki, gördüm səbt olub hər müşkülə bir növ samanı,
Bu qədri çəkmə hicri-yar əlindən ahü əfqanı,
O hansı dərddir kim, olmasın aləmdə dərmanı,
Yazılmış dəhrdə hər dərd üçün bir çarə, səbr eylə.

Vuran Mənsurluq lafın qəmi-darından incinməz,
Özün pərvanə tək şəmə vuran narından incinməz.
O şirin ləlin, aşiq, təlx göftarından incinməz.
Gülüstani-cahanda gül sevən, xarından incinməz,
Əgər yar istəyirsən, təneyi-əğyarə səbr eylə.

Nə qəm, olsa sənə, ey dust, düşmən cümleyi-aləm –
Ki, mülki-hüsn içində, tacidarım, şahsən sən həm,
Çəkib müjgan sipahı eylə yeksər aləmi bərhəm,
Və lakin zəxmi-tiri-yarə hərgiz istəmə mərhəm,
Yetə gər sinən üzrə yarə üstən yarə, səbr eylə.

Əgərçi xurdü xabı eşq üşşaqə həram eylər,
Xəyali-zülfü rüxsarı günün möhnətlə şam eylər,
Nə Əflatun bu dərdin çarəsin, nə Cəm, nə cam eylər,
Olur ki, vəsli-dilbər bir gün, ey məh, iltiyam elyər,
Əgər Seyyid kimi könlün ola sədparə, səbr eylə.

Guş qıl ey ki, bilirsən özüvi vaqifi-kar,
Agəh ol gör ki, nədir naleyi-ney, nəğmeyi-tar,
Nədir ol xüşk olan çubdə bu nalöyi-zar–
Ki, sədasından onun qarət olur səbrü qərar,
Açma sən pərdəni, hər pərdədə var yüz əsrar.

Qoymaz ol tarı müğənni niyə ağuşindən,
Düşməz ol xanəbərəndazlərin duşindən,
Huş ilə guş edə hər kimsə, gedər huşindən,
Pənbeyi-qəfləti çək sən dəxi can guşindən,
Ta ki, əsrari-nihanə olasan bərxurdar.

Ləhni-Davudi ilə könlüvü qıl xürrəm sən,
Ərş baminə, gözüm, nəğməni tut sülləm sən.
Olma qal əhli, qıl əmdən özüvi əbkəm sən,
Kəsb elə elmü ədəb feyzin əgər adəmsən,
Fəhm qıl, gör ki, nədir musiqiyü müsiqar.

Tut bərabər dəmi-İsayə müğənni dəmini,
Qılıb ehya özüvi, seyr elə ruh aləmini.
Ziri-qəm olma, eşit nəğmeyi-zilü bəmini,
Çəkmə, aqilsən əgər, dəhri-müxalif qəmini,
Şurə gəl, nəğmə ilə çək qəmi-dünyayə həsar.

Musiqi məclisinin əhli gərək əhli-bəsər,
Ta görə pərdeyi-əsrardə yüz nəqşü süvər,
Kim ki zövq əhli-degil, ani hesab eylə həcər,
Ləhni-Davud eləməz növi-cəmadatə əsər,
Məni ərbabı edər guş süxən, ey huşyar.

Fəhm qıl, gör ki, nədir çənkü dəfü bərbətü ud,
Nədir onlarda bu ahəngü bu ləhnü bu sürud,
Arif ol, rəmz bil, ey mahəsəli-qeybü şühud,
Ud hər ləhzə gəlib şurə deyər: ya məbud,
Tar hər ləhzə gəlib vəcdə deyər: ya səttar.

Zahida, tarıya bax, məclisi-ürfandır bu,
Tarı əsbabi-mənahi demə, böhtandır bu,
Meyi gör, saqiyə bax, Kövsərü qilmandır bu,
Cümləsi pərtövi-rüxsareyi-sübhandır bu,
Meydə həq nurunu gör, səhvinə qıl istiğfar.

Ey könül, məhrəmi-raz eyləmə biganələri,
Vermə naəhl əlinə bu dolu peymanələri,
Çək rümuzat ilə zülfi-süxənə şanələri,
Seyyida, Mehdiyə yalvar ki, bu dürdanələri
Eyləsin məclisi-şəhvari-Kərim bəgdə nisar.

* * *

Şəhri-Şirvanın əcəb dilbəri-dilculəri var,
Gülbədən, qönçədəhən, sadəvü məhruləri var,
Bu Xəta mulküdü, həryanda çox ahuləri var,
Yüz ləbi şəhdü-fəkər, zülfi səmənbuləri var,
Yüz qədi sərvi-səhi, gözləri caduləri var.

Hər nə bu şəhrdə kim var isə çox məhrulər,
Hər biri bir kəsə bir növ ilə dilculuq edər,
Hər zaman aşiqə yüz lütf ilə meyl eylərlər
Bu mələkruyü mələkxuyü mələksimalər,
Yaxşı xasiyyəti, çox yaxşı gözəl xuləri var.

Xameyi-sün verib gör necə rövnəq bulara,
Yaraşır şiveyi-məhbubluq ancaq bulara,
Dəstrəs əhli-Şamaxı olub əlhəq bulara,
Belə nemətləri kim, qismət edib həq bulara,
Bilmirəm mən buların daxı nə qayğuləri var.

Bunların cümləsinin şiveyi-rəftarı gözəl,
Xülqü xoş, xuyi pəsəndidə, hər ətvarı gözəl,
Çeşmi-xummarı gözəl, türreyi-tərrarı gözəl,
Güli-rüxsarı gözəl, ləli-şəkərbarı gözəl,
Hamısından bu gözəl kim, yumuşaq suləri var.

Çoxdu bu şəhrdə gərçi sənəmi-laləüzar,
Buların leyk, bir ayinəbədən sərvəri var,
Ədədi-ismidir əbcədlə "sədü bistü çəhar".
Müjəsi navəki-dilduzdü, çeşmi xunxar,
Həbbəza, yayi-müqəvvəs kimi əbruləri var.

Ah, kim, Seyyid onun eşqi ilə zar oldu,
Dami-geysusuna pabəndü giriftar oldu,
O Əyaz idi ki, Məhmudə gedib yar oldu,
Genə bu dürri-yətimə o xəridar oldu –
Kim, onun həm belə yüz Yusifi-xoşxuləri var.

# Müsəddəs

Xoş ol zaman ki, yar mənə həmzəban idi,
Bəzmim cəmali-yar ilə rəşki-cinan idi,
Sultan idim ki, hər yana hökmüm rəvan idi,
Dövlət qulam idi mənə, bəxtim cəvan idi,
Cani-həzinə həmdəmü arami-can idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Xurşidgun şərablə dolmuşdu camımız,
Ol mah ilə keçirdi bizim sübhü şamımız,
Dövri-fələkdə hasil olurdu məramımız,
Xaki-dərindən özgə yox idi məqamımız,
Bülbüllərə o səhəti-qüds aşiyan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Hicrin əgərçi görmüş idim mübtəlalərin,
Dildən-dilə eşitmiş idim macəralərin,
Bunca təsəvvür eyləməz idim bəlalərin.
Can çəkiş idi möhnəti-hicran cəfalərin,
Xəlvətsərayi-vəsldə dil kamran idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Könlüm o mahdən açılırdı kərəm görüb,
Mehrin ziyadə, cövrü cəfasını kəm görüb.
Ol gül mənə açıldığını dəmbədəm görüb,
Bəzmi-visaldə özünü möhtərəm görüb,
Rəşk ilə qönçə tək dili-bədxah qan idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ol gül mənimlə həmdəm idi hər bahardə,
Gəh dəməni-çəməndə, gəhi laləzardə,
Bülbül təki işim yox idi ahü zardə,
Seyyid ki, məskən etmiş idi kuyi-yardə,
Ezaz ilə bir Adəmi-cənnətməkan idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

# Müstəzadlar

Ey arizi əhli-nəzərə Kəbeyi-ülya,
Kəbə sənə şeyda.
Kuyündü Mina aşiqə, yox-yox, dəxi əla,
Qurban sənə dünya!
Nazik bədənim, mahvəşim, bu nə səfərdir,
Həngami-xətərdir.
Hala ki, edib mehr Əsəd bürcünü məva,
Var şidəti-gərma.
Gün qarşısına çıxma ki, niyluferi-tərsən,
Əfsürdələnərsən.
Sərçeşmeyi-çeşmimdə gərəkdir sənə sükna,
Ey gözləri şəhla.
Ta yetməyə nazik tənüvə tabi-hərarət,
Ey mahi-məlahət.
Hər ləhzə günə pərdə çəkir göydə Məsiha,
Ey şahidi-rəna.
Ol bərgi-səmən tək ayağın qoyma rikabə,
Salma məni tabə.
Qurbanın olum, payi-lətifin çəgər iyza,
Ey laleyi-həmra.
Nazik bədənin qərq eləmə aləti-cəngə,
Əl vurma tüfəngə.
Çiynində tüfəng bağı əgər zəxm edə peyda,
Ölləm məni-rüsva.
Xəncər nə rəvadır, gözəlim, muy miyanə,
Salma məni qanə.
Şaxi-qətəri çəkmə gəl ağuşuva, yara,
Ey yari-dilara.
Gər qeyr eləyə Beyti-xudavəndi ziyarət,
Həm eyləyə ricət.
Pişvazə nə lazım çıxasan, ey büti-ziyba,
Vey şahidi-yəğma.
Ey gül, sən özün Kəbeyi-ərbabi-səfasən,
Həm nuri-xudasən.
Xali-siyahindir Həcərül-əsvədə həmta,
Ey mayeyi-sövda.

## “BEYTÜSSƏFAYƏ”

Şirvanə səni eylərəm, ey namə, rəvanə,
Dön abi-rəvanə.
Çək şölə, tutub bəzmi-əhibbadə zəbanə,
Gəldikdə zəbanə.
Ol məclisə kim, ruhül-əmin almasa rüsxət,
Yox girməyə fürsət.
Torpağə düşüb əczlə üz qoy o məkanə,
Tap anə bəhanə.
Zuinin ayağından öpüb kəsbi-ziya qıl,
İzhari-səna qıl.
Əhvalımı çək Bixudə rəmz ilə bəyanə,
Şərh eylə əfsanə.
Ol vəqt ki, halım elədin Qafilə izhar,
Bir gizli sözüm var;
Əhbabda məhrəm odu bu sirri-nihanə,
Kəşf etmişəm anə.
Ol kakili-müşkinə elə ərzü səlamım,
Çək əcz ilə namım.
Sərbəstə deyim, yəni filan ibni-filanə,
Ol cani-cahanə.
Ol qaşı kəman, kiprigi ox yarımı görsən,
Dildarımı görsən,
Təqriblə söz aç, məni ol qaşı kəmanə
Ver böylə nişanə:
Kim, sən büti-Leylayə giriftar olan aşiq,
Bimar olan aşiq,
Məcnunə dönüb, aləm ara oldu fəsanə,
Məğlubi-zəmanə.
Şəmə dolanır yad edib ol arizi-alı;
Parvanə misalı.
İstər səni, hər ləhzə, gəzər xanəbəxanə,
Ey dürri-yeganə.
Ey dustlər, ol şux ilə içdikdə şərabı,
Cami-meyi-nabı,
Bir yadə salırsız məni-avarəni, ya nə?
Qaldım yana-yanə.
Siz rahət ilə ləzzət edin beyti-Səfadə,
Seyyid bu bəladə.
Döndü cigərim firqətinizdən dəxi qanə,
Yox təndə təvanə.

* * *

Dünyadə cəfasız bizə bir yar tapılmaz,
Dildar tapılmaz.
Məşhur məsəldir; güli-bixar tapılmaz,
Gülzar tapılmaz.
Sünbül nəçidir kim, ola ol zülfə bərabər,
Ey laleyi-əhmər,
Zülfün kimi bir nafeyi-tatar tapılmaz,
Bir tar tapılmaz.
Qəddin kimi var bağdə çox sərvü sənubər,
Şimşad ilə ər-ər,
Onlarda vəli səndəki rəftar tapılmaz,
Ətvar tapılmaz.
Bu rənci-xumar eylədi dilxun məni, saqi,
Yoxmu meyi-baqi,
Camında məgər badeyi-gülnar tapılmaz,
Asar tapılmaz.
Biz gövhəri-pürqiymətı-gəncineyi-canıq,
Bir gənci-nihanıq.
Qaldıq, bizə dünyadə xəridar tapılmaz,
Bazar tapılmaz.
Əsrari-xudadən dilü canımdı ləbaləb,
Divani-mürəttəb,
Şərh etməgə bir məhrəmi-əsrar tapılmaz,
Dəyyar tapılmaz.
Sövdayi-qəmi-zülfdə artırdı fəğanın,
Tərk eylədi canın,
Seyyid kimi bir şairi-biar tapılmaz,
Bikar tapılmaz.

## “BEYTÜSSƏFAYƏ”

Ey dustlər, ol sərvi-xuraman sizin olsun,
Canan sizin olsun.
Seyri-güli-gülzarü gülüstan sizin olsun,
Reyhan sizin olsun.
Biz atəşi-hicran ilə duzəxlərə yandıq,
Sövdayə boyandıq.
Vəsl aləmi ol rovzeyi-rizvan sizin olsun,
Qılman sizin olsun.
Biz cəm ikən ol silsilədən təfriqə düşdük,
Bu danə ilişdük,
Sərhəlqeyi-geysuyi-pərişan sizin olsun,
Saman sizin olsun.
Zülfü həvəsindən bizə Şam oldu nişimən,
Etdik onu məskən.
Ol arizi xürşid ilə Şirvan sizin olsun,
Dövran sizin olsun.
Ol murxətin qaldı könül vəslinə həsrət,
Yoxdur mənə fürsət.
Gülzari-Səba, mülki-Süleyman sizin olsun,
Fərman sizin olsun.
Ey zahiri ixvani-Səfa, gürgədalər,
Biəhdü vəfalər.
Yəqub mən oldum, məhi-Kənan sizin olsun,
Ol can sizin olsun.
Seyyid təki siz olmayın əlbəttə vəfasız,
Bişərmü həyasız,
Can ol qaragöz dilbərimin, can sizin olsun,
Canan sizin olsun.

# DİNİ, TARİXİ, ƏFSANƏVİ VƏ COĞRAFİ ADLARIN İZAHI

A l i - ə b a – Məhəmməd, Əli, Fatimə, Həsən, Hüseyndən ibarətdir. Buna "pəctəni-ali-əba" da deyilir (əba ailəsi beşliyi).

A l i - b ə n i-ə s ə d – Mədinədə Məhəmmədə köməklik edən qəbilədir.

A l i - ə t h a r – (Pak övladlar) Məhəmməd övladına işarədir.

B a b i l – İndiki İraqda Bağdadın 93 km-liyində, Fərat çayının sahilində yerləşmiş qədim mədəniyyət mərkəzlərindən biridir. Qərbdə ona Vavilyon deyilir.

B a ğ d a d – İraqın mərkəzi, IX–XIII əsrlərdə darülxilafə olmuşdur.

B a ş ı a ç ı q – Gürcüstana işarədir.

B e y t i-x u d a – Kəbəyə işarədir.

B e y z a v i – (Qaziyi-Beyzavi) "Təfsiri-Beyzavi" əsərinin müəllifi, fiqh və şəriət elmlərinin bilicisi kimi tanınmışdır. XIII əsrdə yaşamış Beyzavi Qurana ərəbcə şərh yazan məşhur müfəssirdir.

B ə ş i r – (ibn Cəzləm) Kərbəla əsirlərini Şamdan öz vətənlərinə (Mədinəyə) aparan müşayiətçidir.

B i x ü d – Mollaağa Bixüd (1830–1892) "Beytüssəfa"nın fəal üzvlərindəndir. Əvvəl Seyyidin dostu, sonra düşməni olmuşdur.

B i j ə n – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

B i l a l – (Bilali-həbəşi) Məhəmməd peyğəmbərin azançısı olmuşdur.

"B u s t a n" – M. Sədinin məşhur əsəridir.

B ü r c i - Ə q r ə b – VIII bürcün adıdır. Xalq arasında belə bir əfsanə vardır ki, Ay Əqrəb bürcündə olanda yerə bəla üz verər. Bu Şərq şerində geniş yayılmışdır.

C a l u t – Davud peyğəmbər dövründə Fələstin qəhrəmanlarından biri olmuşdur.

C ə f ə r i - Tə y y a r – İmam Əlinn böyük qardaşıdır. Rumilərlə gedən "Mötə" müharibəsində öldürülmüşdür.

Ç ə n g – Musiqi alətidir.

D a r a – Firdovsinin "Şahnamə" əsərində şah surəti.

D a r ü s s ə l a m – Bağdadın ikinci adıdır.

D ə c c a l – Özünü XII imam (Mehdi) elan edəcək yalançı, həm də əfsanəvi imam.

D ə c l e y i - B ə ğ d a d – Bağdadın ortasından axan çaydır.

D ə l v – XI bürcün adı (ast.).

D i l x u n – Mirzə Ağa Dilxun "Məcməüşşüəra"nın üzvlərindəndir.

D i l k ə ş – Muğamatda şöbədir.

D ü g a h – Muğam adıdır.

Ə b u  L ə h ə b – Məhəmmədin əmisi və onun ən qəddar düşmənidir.

Ə b ü l ç ə p – Muğam şöbəsinin adıdır.

Ə d i - (bin-Müsafir) – Şeyxül-hikari şeyxlərindən olmuşdur. O, Ədəvi təriqətinə mənsubdur. Məşhur sufilərdən Əbdülqadir Gilani, Əbdülqadir Hələvani, Əbdulqadir Şəhrzuri və başqaları ilə həmtəriqət və həmsöhbət olmuşdur. Nəhayət Hekari dağlarına inzivayə çəkilmişdir. Şöhrəti aləmə yayılmış, hər tərəfdən ziyarətinə gəlmişlər. 557-ci hicri ilində vəfat etmişdir. Ehtimal ki, "Ədəvi" sözü şeirdə vəzn xatirinə "Əyad" kimi ifadə edilmişdir.

Ə h m ə d i - M u x t a r – Məhəmmədin ləqəblərindən biridir.

Ə h r i m ə n – Atəşpərəstlərin şər allahıdır.

Ə l i f l a m – Quranın 2-ci surəsinin başlanğıcıdır.

Ə m r  z e y d – Ərəb qrammatika kitablarında çox işlənən addır.

Ə r b a b i-S ə f a – "Beytüssəfa" məclisinin üzvlərinə işarədir.

Ə r ə s – Araz çayı.

Ə s ə d – Şir bürcü (ast.).

F ə r a t – Kərbəla səhrasından axan çaydır.

F ə z l i - ə c ə m – XII əsr azəri ədəbiyyatının dahilərindən biri olan Əfzələddin Xaqaninin ləğəbidir. Ona bəzən "Həssani-əcəm" də deyilir.

F i r i d u n – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

"G ü l ü s t a n" – Sədinin məşhur əsəridir.

H a r u t  v ə  M a r u t – Əfsanəvi mələk adlarıdır.

H a t ə m – (Hatəm Tai) İslamiyyətdən əvvəl yaşamış və öz səxavəti ilə məşhur olmuş bir ərəb varlısıdır.

H ə c c a c – (ibn-Yusif) VIII əsrin axırlarında Bəni Üməyya xəlifəsi Əbdülməlik ibn-Mərvan tərəfindən Məkkəyə təyin edilmiş qəddar bir hökmdar olmuşdur.

H ə c ə r ü l - ə s v ə d – Kəbədə məşhur daşın adıdır. "Həcərül-əsvəd" qara daş deməkdir.

H ə m ə l – I bürcün adıdır.

H ə s a r – Muğam adıdır.

H ə s s a n i - ə r ə b – VII əsrdə Məkkədə yaşamış məşhur ərəb şairi Həssan ibn-Sabitin ləğəbidir. Qədim ərəb şerini gözəlləşdirən, ona yeni istiqamət verən, novator sənətkar birinci islam şairidir. Adının mənasına uyğun olaraq, "Həssani-ərəb" ləğəbi ilə Yaxın Şərq ədəbiyyatında məşhurdur.

H i c a z – 1. Səudiyyə Ərəbistanı. 2. Muğam adıdır.

X a q a n – Türk hökmdarlarının titulu.

X ə t i - r e y h a n – Ərəb xətt növüdür.

X ə z r ə c – Mədinədə Məhəmmədə kömək edən bir qəbilədir.

X u n i - O s m a n – (Dəmi-Osman, Osman qanı) III xəlifə Osman onu öldürməyə gələnlərdən qorunmaq üçün Quranın vərəqələrini oxumağa başlayır. Üsyançılar buna baxmayaraq onu öldürürlər. Osmanın qanı həmin quranın vərəqlərinin üstünə tökülür.

X ü l l ə x – Öz gözəlləriylə məşhur olan bir şəhərdir.

X ü l lə r – Saf şərabıyla məşhur olan yerdir.

İ n c i l – Xaçpərəstlərin müqəddəs kitabıdır.

İ r ə m – Cənnət bağı.

İ s f ə n d i y a r – Firdovsinin “Şahnamə” sərinin qəhrəmanlarındandır.

K e y d i - i x v a n – Qardaşların hiyləsi, qardaşlarının aldadıb Yusifi quyuya salmaqlarına işarədir.

K ə n a n – Suriya və Fələstinin bir hissəsi də daxil olmaqla qədim bir ölkə olmuşdur.

K ə n z – XV əsrdə yaşamış Məhəmməd ibn-Əbdülxaliq Gilaninin “Kənzül-Lüğət” (lüğətlər xəzinəsi) adlı lüğət kitabı.

K ə r i m b ə y – Seyyidin dostudur. Kərim bəy Şıxəlibəyov Şamaxının prokuroru olmuşdur.

K ə ş t i y i - N u h – Dini-rəvayətə görə, guya vaxtilə dünyanı su basmış, Nuh adlı peyğəmbər böyük bir gəmi düzəltmiş, öz ümmətini tufandan xilas etmişdir.

K i r m ə g i - ş ə b t a b – Gecə işıq saçan bir cücüdür ki, Süheyl ulduzunun işığından belə öz işığını itirir (yəni ən zəif işıq saçan).

Q a f i l – Əli Əkbər Qafil (1818–1891) Şamaxıda “Beytüssəfa” ədəbi məclisinin üzvü olmuşdur.

Q a n u n – Musiqi alətidir.

Q a r u n – Eramızdan əvvəl yaşamış varlı, xəsis və qəddar bir hökmdar olmuş, guya Musanın qarğışı ilə dövləti ilə birlikdə yerə batmışdır.

Q a s i r – Mirzə İsmail Qasir (1805–1897) əslən şamaxılıdır. Bir müddət Lənkəranda yaşamış və orada təşkil olunan “Fövcül-Füsəha” adlı ədəbi məclisə başçılıq etmişdir.

Q e y s ə r – Rumda hökmdar titulu olmuşdur.

Q ə n b ə r – Əlinin istəkli qulamı olmuşdu.

Q u b a r i – Ərəb xətt növüdür.

Q ü l z u m – Dəniz deməkdir.

L a t v ə M ə n a t – Müsəlmanlıqdan əvvəl Kəbədə olan ən böyük bütlərdir.

L e y l ə t ü l - q ə d r – (Qədr gecəsi) Quran rəvayətinə görə ilk ayənin Məhəmmədə nazil olduğu gecə.

M e h d i – Seyyidin dostu, görkəmli musiqişünas və xanəndə olmuşdur.

M ə h ə m m ə d H ə s ə n – S.Ə.Şirvani dövründə Mahmud Ağanın məclisinin xanəndəsi olmuşdur.

M ə h m u d i - x u d a – Məhəmmədə işarədir.

M ə n s u r – (Mənsur ibn-Həllac) İranın Beyza şəhərindəndir. “Ənəlhəqq” (mənəm allah) şüarını yaydığı üçün xəlifə Müqtədir Billahın əmri ilə 306-cı hicri ilində Bağdadda dara çəkilmişdir.

M ə r r i x – Mars planeti. Şərq şerində müharibə və qan rəmzi kimi işlədilir.

M ə s c i d i - Ş a h – Gəncədəki Şah Abbas məscidinə işarədir.

M ə s i h a – İsanın ləğəbidir.

M i n a – 1. Məkkə yaxınlığında dağdır. 2. Şərab şüşəsi.

M i z a n – VII bürcün (Tərəzi bürcü, ona Kiçik Ayı bürcü də deyilir) adıdır.

M ü r t ə z a – Əlinin ləğəblərindən biridir.

M ü s ə v v i r – Mirzə Məhəmməd Müsəvvir "Məcməüşşüəra"nın üzvü olmuşdur.

M ü ş t ə r i – Yupiter planeti.

N ə v a – Muğam şöbəsinin adıdır.

N i t q i - M ə s i h a – İsanın nitqi (nəfəsi) ölüləri dirildirmiş – rəvayətinə işarədir.

N o v r ə s – Mirzə Ələsğər Novrəs (1846–1918) "Məclisi-fəramuşanın" üzvlərindən olmuşdur.

P ə n c g a h – Muğam adıdır.

R a ğ i b – Qafar Rağib (1818–1892) "Beytüssəfa" ədəbi məclisinin üzvü olmuşdur.

R a h i l – Yusifin doğma anası.

R ə h a v ə n d – Muğam şöbəsidir.

R ə x ş – "Şahnamə" qəhrəmanı Rüstəmin atının adı.

R u h ü l - ə m i n – Cəbrailə işarədir.

R u m – Qədim Vizantiyaya verilən addır. Bu imperiyanın bir hissəsi türklərin əlinə keçdikdən sonra Türk dövləti və Kiçik Asiyada Rum adlanmağa başlamışdır.

R ü b a b, r ə b a b – Musiqi alətidir. Yunan əsatirində "Rəd və rəbab" adlı bir məhəbbət dastanı da məşhurdur.

R ü s t ə m – Firdovsinin "Şahnamə" əsərinin baş qəhrəmanıdır.

S a r a – İshaq peyğəmbərin anasıdır.

S ə b a – (Səbayeli, Şəhri-Səbayel, Gülzari-Səba və s.) Əfsanəvi bir şəhərin adıdır. Guya bu şəhər qədim Bakı şəhəridir. Hazırda Səba şəhərinin qalıqları Bayıl yaxınlığında dənizin içərisindədir. Rəvayətə görə Süleyman peyğəmbər bu şəhərin hökmdarı gözəl Bilqeysə aşiq olubmuş.

S ə d d i - İ s k ə nd ə r – Məşhur Çin divarına işarədir.

S ə f a – Məhəmməd Səfa (1851–1876) S.Ə.Şirvaninin yaxın dostu olmuşdur. Ona bəzən Qara Məhəmməd də deyirmişlər. "Beytüssəfa" ədəbi məclisi onun evində təşkil edildiyi üçün (Səfanın evi) Səfanın adı ilə bağlı olmuşdur. Seyyidin əsərləri içərisində ən çox Səfanın adı çəkilir.

S ə h a h – X əsrdə yaşamış məşhur tacik alimi Əbunəsr İsmail Əlcövhərinin "Səhahül-Lüğə" adlı ərəb dilinə aid izahlı lüğət kitabıdır.

S ə l m a n – Məhəmmədin yaxın adamlarından olmuşdur. Səlmanın əsli farsdır. O, əvvəl atəşpərəst sonra xaçpərəst olmuş, nəhayət müsəlmanlığı qəbul etmişdir.

S ə n t u r – Musiqi alətidir.

S ə r f – O zaman məktəblərdə tədris edilən Ərəb qrammatikası (morfologiya).

S i f a h a n – İranın qədim mədəniyyət mərkəzi, Şah Abbasın paytaxtı olmuşdur.

S i n a – Dini rəvayətə görə Musanın allahla danışdığı dağın adıdır.

S i y a v u ş – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanı.

S ö h r a b – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanıdır.

S ü f ya n – Müaviyənin ulu babasıdır.

S ü h a – Böyük Ayı bürcünə daxil olan ulduzlardan (Yeddi qardaş) ən kiçiyinin adıdır.

S ü r ə y y a – Ülkər ulduzu.

Ş a h x ə n d a n – XIV əsr Azərbaycan ədəbiyyatının böyük sənətkarı İmadəddin Nəsiminin qardaşıdır. Qəbri Şamaxıda öz adına olan qəbristanlıqdadır. S.Ə.Şirvaninin vəsiyyətinə görə (Mən öləndə “Şaxanda” dəfn eyləyin, çünki onun şahidi-Xəndanı var) həmin qəbristanda dəfn edilmişdir.

Ş ə r a y i - Y ə m a n i – Parlaq bir ulduzun adıdır.

T a h a – Quran surəsinin adıdır.

T i ğ i - d ü s ə r – Əlinin qılıncına işarədir.

T u b a – Dini rəvayətə görə cənnətdə çox kölgəli bir ağacın adıdır.

Ü v e y s i-q ə r ə n i (-bin Amir) – Yəməndə öz müqəddəsliyi ilə məşhur olmuşdur.

Ü z z a – Kəbədə olan bütlərdən birinin adıdır.

Y ə d i-M u s a – Dini əfsanəyə görə Musa əlini yaxasına salıb çıxardıqda əli parlayar, işıq saçarmış. Bu Musanın möcüzələrindən biri kimi Şərq şerində (“Yədi-beyza” – parlaq əl) geniş yayılmışdır.

Y ə h y a – Peyğəmbər olmuşdur.

Y ə s r i b – Məkkənin əsil adıdır.

Y u n i s – Peyğəmbər olmuşdur.

Z ə b u r – Davud peyğəmbərin müqəddəs kitabının adıdır.

Z ə n d – “Avesta”nın şərhidir.

Z u i – Mirzə Mahmud Zui “Beytüssəfa” ədəbi məclisinin üzvü olmuşdur.

Z ü h ə l – Ulduz adıdır.

Z ü l f ü q a r – İmam Əlinin ikibaşlı qılıncının adıdır.

## KİTABDAKILAR

